*Bu kitab "**Nəbi Xəzri.** Seçilmiş şeirlər, poemalar və pyes.*
*Üç kitabda, II-III kitablar"* (*Bakı, XXI – Yeni Nəşrlər Evi, 2002*)
*nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

**894.361'1 - dc 21**
**AZE**
**Nəbi Xəzri. Seçilmiş əsərləri.** İki cilddə. II cild. Bakı, "Lider nəşriyyat", 2004, 264 səh.

Çağdaş Azərbaycan poeziyasının görkəmli nümayəndəsi, xalq şairi Nəbi Xəzrinin seçilmiş əsərlərindən ibarət olan bu cildə şairin ayrı-ayrı vaxtlarda qələmə aldığı şeir və poemalar daxil edilmişdir. Mövzu üfüqlərinin genişliyi və rəngarəngliyi ilə səciyyələnən bu ədəbi nümunələr tanınmış şairin yaradıcılığı haqqında dolğun təsəvvür yaradır.

**ISBN 9952-417-20-7**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



## SÖZÜN MƏNASI

Ürək atəşindən
söz su içəndir,
Odu da, suyu da
yaxıb keçəndir.
Söz əsil sultandır,
söz padişahdır.
Söz ulu məbədgah,
söz qibləgahdır.
Söz ki həm əsgərdir,
həm də sərkərdə.
Ölürsə, mərdanə
ölür səngərdə.
Sözə səcdə etmək
bəxtdir, qədərdir,
Sözündən qaçanlar
fərarilərdir!

Söz ki, nə boyadır,
nə də ki, riya,
Sözdən təmiz varlıq
görməyib dünya!
Bu gün sözə min-min
rəng vuranlar var
Xırman taxılı tək
sovuranlar var
Söz məddah dilində
ah-aman çəkir,
Bu dərdi yer çəkir,
asiman çəkir.
Axı nəyə lazım
söz olsun dərin?
İndi zamanıdır
söz düzənlərin!

Sözlə rütbələrə
çatanlar nə çox!
Sözün kölgəsində
yatanlar nə çox!
Unutma!
Sözün də
öz məqamı var,
Sözün nadanlardan
intiqamı var!
O, qəlbən qürurlu,
ruhən haqdır o,
Nankor boğazından
tutacaqdır o.
O, xalq tarixini
nəqş edən sözdür,
Ana dilimizi
bəxş edən sözdür.

Ürək atəşindən
söz su içəndir,
Odu da, suyu da
yaxıb keçəndir.
Ürəkdən gəlməyən
ürəksiz olur.
Ürəksiz söz də ki,
gərəksiz olur.
Demirəm bəd sözlə
üzün ürəyi,
Ürəyin özüdür,
sözün ürəyi.

*15-16 yanvar 2000*

## QORUYAM GƏRƏK

*Dünya şöhrətli müğənnimiz*
*Zeynəb Xanlarova üçün*

Əyər külək qopub
                    tufan coşarsa,
Səni küləkdən də qoruyam gərək!
Ömrə fələk birdən kələk açarsa,
Səni fələkdən də qoruyam gərək!

Səni yerə, göyə,
                    qısqandıqca mən
Gur seldən, çaydan da qoruyam gərək!
Eşqini atəşin od sandıqca mən,
Günəşdən, Aydan da qoruyam gərək!

Mənim dəyməsə də
                    heç kəsə gözüm,
Səni gözümdən də qoruyam gərək!
Səni özümdən çox sevsəm də özüm,
Səni özümdən də qoruyam gərək!

*1997*

## MƏNİ AXTARANLARI AXTARIRAM

*Sənə səcdə edərdi*
*Səndən xeyir görənlər,*
*Qapılar bağlananda*
*Pəncərədən girənlər.*
***N.Xəzri***

Sən məni axtaranda
uça-uça gələrdim,
Sizin dərdinizi də
doğma dərdim bilərdim.
Haçan bəlalar sizə
qurd tək ağzını açdı,
Sizi görmək mənimçin
böyük ehtiyacdı.
Kiminiz ucalarda
bu gün çox məğrursunuz,
Kiminiz ağzınıza
su alıb susursunuz.
Kiminiz şirin-şəkər
şirkətlərin sahibi,
Kiminiz məclislərdə
qaliblərin qalibi!
Neçin görən həyatın
sərt yoluyla keçəndə –
İnsan gəzir insanı
yalnız işi düşəndə.
Bu gün sizə qəzəbim
coşsa da ümman kimi,
Mən sizə bağlamıram,
qapımı, pəncərəmi.
Mən bunu bacarmaram,
bacarmaram mən bunu.
Sədaqətin ilki var,
sədaqətin yox sonu.
Ürək ömür yolunda
qəm-kədər daşıyandır.

Ürəksiz kəslərə də
          ürəyim asiyandır.
Ya qəlbi dinləməyim, –
                    vursa da titrək-titrək, –
Ya onu öz sinəmdən
                    kəsib tullayım gərək.
Köksümü yarsam əgər
Birdən ürək içində
                    kiməsə yara dəyər.
Bəlkə təbiət ağlar,
                    susar çağlayan dəniz,
Siz mənsiz yaşarsınız,
                    mən neylərəm ürəksiz?
Nolsun bəzən mən toxam,
                    nolsun bəzən acam mən.
Bir dost hərarətinə,
                    xoş sözə möhtacam mən.
Mən sözə hökmdaram,
                    başda qızıl tacam mən,
Bir mehriban baxışa,
                    pak qəlbə möhtacam mən.
Gərək bu həqiqəti
                    yer üzünə açam mən,
Heç nə yox, ağlamağa,
                    gülməyə möhtacam mən.
Ürəyim kainatda
                    qəm-kədər daşıyandır,
Ürəyim sadiqlərə,
                    mərdlərə aşiyandır.
Hardasınız bu gün siz
                    sadiqlərim, mərdlərim
Bir təmənnam yox, mənim,
                    harayıma hay verin!
Sağıq, hələ həyatdan
                    köçmək zamanı deyil!
Bir yalan eşidim ki,
                    dünyamız fani deyil.

*17-19 avqust 1996*

## ŞƏXS VƏ ŞƏXSİYYƏT

Arzu şəxsiyyətlə
açır qol-qanad
Arzu sona çatsa, ümid də yoxdur!
İgidlər çiynində
durur kainat,
Şəxsiyyət yoxdursa,
igid də yoxdur!
Şəxsiyyət bəzəyir
göyü, yeri də,
Axı bunda böyük
bir sirr də yoxdur!
Şəxsiyyət qələmi
yazır şeri də,
Şəxsiyyət yoxdursa,
Şair də yoxdur!
Bağlıyam insanın
ancaq mərdinə,
Ədalət yoxdursa,
həqiqət yoxdur!
Vicdan yanmayırsa,
elin dərdinə,
Hər şirin sözdə də
Sədaqət yoxdur.
Düşünək
Ötdükcə
İl dalınca il,
Hər şəxs də dünyada
şəxsiyyət deyil.

*14 mart 1999*

## KAŞ BİLSİN...

Vüsala yetməkdir – arzu dünyada,
Ağ günü gözləyib qara geyən var.
Ən böyük həqiqət sevgi olsa da,
Yalandan gözələ "sevdim" deyən var.

Sanıram ümidlə tale dinəcək,
Torpaq sevinəcək, göy sevinəcək.
Səmadan ilahi mələk enəcək,
Mənə elə gəlir qapı döyən var.

Ümidsizlik nuru artıq sönürmü
Zülmətdə parlayan incimi, dürmü?
Sahilsiz məhəbbət geri dönürmü?
Ümman yoxdursa da, ləpədöyən var.

Dinimmi, o məni səsləməsə də,
Gedimmi, o mənə “gəl” deməsə də?!
Kaş bilsin, o məni gözləməsə də
Yollar ayrıcında yol gözləyən var!

*2 yanvar 1998*

## YOLÇU

Mən niyə doğuldum
Dünya üzündə?
Bilmədim min qaya,
Min uçurum var!
Yer üstə ilk qədəm
Atdığım gündə,
Bilmədim bu qədər
Ağır yolum var!

İllər pərvazlandı
Ağ qanad kimi,
Başım Aya dəydi,
Ulduza dəydi.
Yollar şahə qalxan
Köhlən at kimi –
Elə bil cilovu
Əllərimdəydi.

Keçdi sərhədlərin
Lal məhvərindən,
Ümmanlar qoynuna
Baş vuran yollar.
Sinəmin üstünə
Sərildi birdən
Gecə kəhkəşan tək
Ağaran yollar.

Dağlar dumanlıydı,
Zirvə buluddu.
Köksümdən axırdı
Söz düzüm-düzüm.
Yolu dolu vurdu,
Yolu buz tutdu,
Yolsuz yollardan da
Yol tapdım özüm!

Bilmədim "dilənçi",
"Yolçu" sözləri,
Nə üçün bənzərdir
Əzəldən bəri?

Nə yollar yoruldu,
Nə mən yoruldum,
Ac ellər gördüm ki,
Ah qalxdı göyə.
Dilənçi olmadım,
Mən yolçu oldum,
Deyəsən az qalır
Dilənçiliyə!

*28 avqust 1999*

## ƏZİZ DOSTUM!

*Əsrimizin görkəmli alimi*
*Budaq müəllim Budaqova ithaf*

Doymadıq Xəzərin
sərinliyindən,
Açdıq qəlbimizi dənizə, dostum!
Keçdikcə biz ömrün cəngəlliyindən
Nə qədər gec gəldik üz-üzə, dostum!

Qəlbən təbiəti
qardaş sanırsan,
Önündə ağaclar baş da əyiblər.
Sən ki min budaqlı məğrur çinarsan
Sənə "qoşa budaq" nahaq deyiblər.

Ömürdən gün gedər,
ömrə gün gələr,
Günlərin ağı var, qarası vardır.
Təbiət özü də, yəqin fəxr elər, –
Sənin tək təbii arxası vardır.

Torpağa bağlanan
müqəddəs ömrün
Duyğusu hər güldən, çiçəkdən keçir.
Milləti ürəkdən sevənlər üçün
Coğrafi sərhədlər ürəkdən keçir.

Mehriban baxışlar
pak nur kimidir,
Həqiqəti deyək, axı insafdır.
Səndə düşüncələr büllur kimidir,
Təfəkkür safdırsa, fikir də safdır!

Dalğındır...
Sabahı o görən alim,
Kimsə başı üstdə dayanır səssiz.

Əzizdir dünyaya nur verən alim,
Alimə nur saçan qadın da əziz!

Bu gün parçalanıb
                    yer kürəsi də,
Hər daşı qorumaq zəmanəsidir.
Qədim ana yurdun xəritəsi də,
Tarixin əbədi xatirəsidir!

Dedin ki, aqillər
                    meydana gəlsin,
Uludur obaya, elə sədaqət!
Xəyali həqiqət gəzənlər, bilsin,
Vətən torpağıdır Ali həqiqət!

Doymadıq Xəzərin
                    sərinliyindən,
Açdıq qəlbimizi dənizə, dostum!
Keçdikcə biz ömrün cəngəlliyindən
Nə qədər gec gəldik üz-üzə, dostum!

Gəl, birgə dolaşaq
Dağı, ormanı,
Yaxşı ki, doğmalar
Tapır doğmanı!

*21-31 yanvar 1999*

## GEDİR

Duyğular şəhvətə satıldığından
Ürəkdən köç edib
məhəbbət gedir.
Bulanlıq sel gəlir eşqin dağından,
Məhəbbətlə birgə
sədaqət gedir.

Başımız üstündə şimşək çaxdıqca,
Bədbəxtlik yandırır,
səadət gedir.
Hökmran taxtına yalan çıxdıqca
Bizdən üz döndərib
həqiqət gedir.

Varlılar keyf çəkir xanimanlarda,
Dilənçi çoxalır,
səxavət gedir.
Yerlərin fəryadı asimanlarda,
Əl açan kəslərlə
ləyaqət gedir.
Sındıqmı önündə məşum küləyin?
Satqınlıqla qoşa
cəsarət gedir.
Sabah məzarıma gəlib söyləyin:
Torpaq azad olur,
əsarət gedir.
Bilim ki, ədalət qanadlarında
Şöhrət geri dönür,
xəcalət gedir.
Onda rahat yatım öz məzarımda
Bilim, torpaq üstdən
dərd, həsrət gedir.

*20–25 dekabr 1998*

## BİR İL

Bu il gördüyüm qız – Günəşdi, Aydı?
Bu il necə uzun, necə qısaydı?

İstəsə, dönərdim saf ümmana mən,
Onu quçmaq üçün ləpələnərdim.
İstəsə, dönərdim kəhkəşana mən,
Onunçun kəmər tək yerə enərdim.

İstəsə, dönərdim Kəpəz dağına,
Göy göldən axardım şəlalə kimi.
İstəsə, dönərdim göy qurşağına,
Onun başı üstdə zər halə kimi.

Ehmalca telləri oxşadım ki, mən
Pərişan söyüdlər saçıydı, sanki.
Bir ildə bir ömür yaşadım ki, mən
Min-min ömürlərin tacıydı, sanki.

Qəlbim atəşlərlə parçalansa da,
Kədərlər, qüssələr sanki heç oldu.
Sevgiyə inamım haçalansa da,
Sevgiyə ümidim birə üç oldu.

Hər an gözləsəm də, görüş xəbəri,
Ol! – dedim, – gözəlim sən özün təki.
Ümidlə açıldı ilin səhəri,
Axşamı ümid də söndü gün təki.

Bir ilin günləri karvan kimiydi,
Karvan qumluqlarda seyrəldi, keçdi.
İl bəlkə il deyil, bir an kimiydi,
Bilmədim, heç necə o gəldi, keçdi.

Oldu o, bəzəyi göyün, yerin də,
Könlümdə bir həsrət iqlimi qaldı.
Əriyib zamanın üfüqlərində,
İl yenə taledə il kimi qaldı.

O, Aydır, ulduzdur – sirli həyatdır –
Hər il də, elə bil, bir kainatdır!

*28–31 dekabr 1998*

## ZAMAN DÖVR ELƏDİKCƏ

Hökmü fərma olanın,
hökmü rəvan gərəkdir,
Nəyə lazım kükrəyib,
sellər kimi çağlamaq?
Bil, haqsızlıq haqsıza
bəla gətirəcəkdir,
Bir də böyük bəladır –
qəzəbə bel bağlamaq.

Hər insanı uca gör,
öz obanda, elində.
Nədir kimi sevməkçin,
kiməsə kin saxlamaq?
Qəddarlıq kor qılıncdır
hökmdarlar əlində
Sahibinə dağ çəkər
sinələri dağlamaq!

Tərif atı yeyindir,
qürur atı ceydaraq,
Yaraşarmı qüruru
haqsızlıqla haqlamaq!
Qarşıya çıxacaqdır
dərin dərə, uca dağ...
Ancaq çəmənə baxma,
qar tökən dağına bax!

Coşqun tufana dönür,
ədalətin gur səsi,
Evlər yıxdın,
yıxıldın,
faydasızdır ağlamaq!
Qan-qadalı yolundan
Zaman saxlar hər kəsi,
Kim, bacarmış Zamanı
Öz yolundan saxlamaq?

*21 avqust 1999*

## İLLƏR KARVANIM

Gedir aram-aram
öz qatarıyla
Gah susur, gah dinir
gah uçur illər.
Hardasa zınqırov
sədalarıyla
Cahan karvanına
qovuşur illər.
Gedir ləngər ilə,
o asta-asta,
Ardınca nə qədər
nanəcib gedir.
Yanır göy qurşağı
karvanın üstdə,
Zərrin tac altından
o keçib gedir.
Gedir hardan, haçan,
yollara çıxıb,
Mavi üfüqlərə
mehriban olur.
Yerdə dərin-dərin
açılan cığır –
Göylər sinəsində
kəhkəşan olur.
Gedir, doğulduğum
o uzaq gündən,
Yolda çinar durur
cərgələnərək.
İstidə karvanın
əsir üstündən
Xəzərin ətrini
gətirən külək.
Gedir, öz yolundan
dönən deyil o,

Üfüqdə nur yanır,
　　　　nur sönür bəzən.
Onun qarşısında
　　　　qum təpəsi yox,
Dəmir barmaqlıqlar
　　　　görünür bəzən.
Gedir, tufan qopub
　　　　yellər əssə də,
Durmayıb dünyada
　　　　gedəcək yenə.
Karvan sarbanını
　　　　itirərsə də,
O məndən sonra da
　　　　gedəcək yenə!

*2 yanvar 2000*

## YALAN

Uzağa çəkilsin
　　　　bizdən qan-qada,
Sıxılıb ürəkdə
　　　　qəzəbli yumruq.
Nə qədər yalan var,
　　　　yalan dünyada
Zəhərli olsa da,
　　　　yeyib uduruq.
Bahar da görünür
　　　　bizə qış kimi
Haçandan minmişik
　　　　riya atına?
Yalan yumşaq-yumşaq
　　　　bir balış kimi,
Qoyulur millətin
　　　　başı altına.
Qəlb yatır, vicdanlar
　　　　mürgüləyəndə,
Məgər vicdanın da
　　　　yalanı varmı?
Üzlər qızarırdı
　　　　yalan deyəndə
Niyə utanan yox,
　　　　üz də qızarmır!
Yalan görək haçan
　　　　talan olacaq?
Onda yalan özü
　　　　yalan olacaq!

## ŞEİR OXUYARKƏN...

O, sevdiyi qıza
              şeir oxudu,
Döndü misralara
              qəlbinin odu!
Oxudu eşqindən,
              məhəbbətindən,
Taleyin ən ulu
              həqiqətindən.
Düşündü: söz axsın
              duyğular kimi,
Ürəkdə kükrəyən
              dalğalar kimi.
Susdu, nəfəsini
              bir anlıq dərdi:
– Şerin yaxşı mənə
              yuxu gətirdi!
Uçuldu
İlhamdan
              qızıl taci-taxt!
Bəlkə qız haqlıydı,
Şairsə bədbaxt!

*29 may 1999*

## SEHİRLİ GƏLİŞ

Baxdın, düşdü qəlbə
Bir haray gözəl,
Təlaş hakim oldu,
Könlümə hakim...
– Göylərmi göndərdi
Səni ay gözəl?
Sənsə pıçıldadın:
– Yox, özüm gəldim!

Dinlədim, başqa söz
Söylədi gözlər,
Sandım sükutunla
Sehirli səssən.
Sən özün gəlmisən
Müqəddəs izlə,
Deməli, özün də
Sən müqəddəssən!

Yerlərdən ucaltdın
Sən məni göyə,
Uçdum səmaların
Göy ümmanında.
Niyə soyuq baxdın
Müqəddəsliyə,
Mən qaldım tənhalıq
Burulğanında.

Gəldin, bəs getməyə
Niyə tələsdin?
Mənə ümid adlı
Bir həqiqətdin!
Göylər göndərsəydi
Tezcə getməzdin,

Sən özün gəlmişdin,
Özün də getdin.
Yox, yox, inciyirəm,
Mən səndən məgər?
Bəzən bir görüş də,
Bir ömrə dəyər!

*17 iyun 1999*

## ÖLDÜ DEMƏYİN!

*Şair dostum Rəfiq Zəka Xəndanın xatirəsinə*

Bəd xəbər eşitdim...
Kim dedi bunu?
Rəfiq də ölərmiş?
Necə inanım!?
O, həyat aşiqi,
İnsan vurğunu –
Əsl şair oğlu
Azərbaycanın?

Onun sinəsində
Xəzinə vardı,
Xəzinə sonsuzdu
Bir ümman kimi.
Neçə şairləri
O, yaşadırdı,
Şairlər şairsiz
Yetim deyilmi?

Sabah günəşilə
Arzu, diləyin.
O, bəlkə torpaqdan
Çinar tək bitdi.
Yox, Rəfiq Zəkaya
"Öldü" – deməyin.
Sabirlə, Müşfiqlə
Görüşə getdi!

*28 yanvar 1999*

## ÜRƏK DÖNƏNDƏ

Tufana çevrildi
Səhər küləyim,
Necə dözəcəyəm
Mən sənsizliyə?
Nəyinə lazımdır
Mənim ürəyim,
Çalıb ürəyimi
Aparmaq niyə?

Yer kimi, göy kimi
Gərəyim mənim,
Baxtıma o düşən
Sirli baxışdı.
Sənin ürəyinlə
Ürəyim mənim,
Mən elə sandım ki,
Doğmalaşmışdır.
Neylərsən, sızlasa
Qəlbim sinəndə?
Eşqin müəmmalı
Möcüzəsi var!
Çarə var insanın
Üzü dönəndə,
Bəs ürək dönəndə
Nə çarəsi var?

*12 mart 1999*

## AY VƏ GÜN

### I

Səni görən gündən
Dəyişdi dünyam,
Nurumu nuruna
Qata bilmirəm.
Sən parlaq Günəşsən,
Mən solğun Ayam,
İzincə gəlirəm,
Çata bilmirəm.

Şəfəqlər kainat
            sinəsindədir –
İşığın məndədir,
            Qəlbim səndədir!
Elə bil çıxmışam
Ömrün qışından,
Yoxsa yaz qanadlı
Qaranquşam mən?
Elə bil dünyanın
Ay aranışından,
Sənə həsrət üçün
Doğulmuşam mən!

İsti şəfəqlərlə
Gözlər güləndə,
Təbiət qoynunda
Nur unudulur.
Axı Ay Günəşə
yaxın gələndə
Günəş də deyirlər
o gün tutulur.

Sənə yanaşsam da,
            Mən aram-aram,

Səni nur yolundan
            Necə saxlaram?
Ürəkdə qalacaq arzu da, kam da?
Ayam, yoxsa sönmüş
Bir çırağammı?
Səni addım-addım
Mən arasam da,
haçansa mən sənə
Çatacağammı?

**II**

Qaranlıq gecədən
Gündüzə çıxdıq,
Məcnun səhrasından
Əsdi bir külək.

Axı, necə oldu
Üz-üzə çıxdıq,
Görüşdük bir əsr
Görüşənlər tək.
Sən elə tanışdın
Dərdi-sərimlə,
Onunçun yetişdin
Sən imdadıma!
Gəldin öz mübarək
Qədəmlərinlə,
Mənim sevgi adlı
Kainatıma!

Sanki arzulara
Sən işıq saçdın,
Şəfəqin – göylərdən
Axan çay kimi.
Kəhkəşan yoluyla
Ağ qanad açdın,
Elə bil köksümə

Qondun Ay kimi.
Gün kimi parladın
Zirvə qarımda,
Titrədim önündə
Bu möcüzənin.
Mən səni görmüşdüm
            yuxularımda,
Bəlkə də çin olmuş
            yuxumsan mənim?

Gözlədim dünyada
Səni nə qədər,
Bəlkə indi duydum
Təsəlli nədir?
Mən tənha deyiləm
Daha gecələr,
Ay sinəm üstündə,
Gün qəlbimdədir!

## SEVGİMDƏN SOYUYAN GÖZƏL

Məgər aramızda
İncik söz oldu?
Ömrümə gec gəldin,
Hicran tez oldu,
Ey odlu sevgimdən
Soyuyan gözəl!

Mən gördüm üzünü
Bir Günəş kimi,
Günəş də nurunu
Əsirgəyərmi?
Ey odlu sevgimdən
Soyuyan gözəl!

Məgər söyüdəmmi
Əsəm, əyiləm?
Yəqin ki, eşqinə
Layiq deyiləm!
Ey odlu sevgimdən
Soyuyan gözəl!

Məhəbbət olarmı
Ani bir həvəs?
Od oddan alışar,
Od oddan sönməz.
Ey odlu sevgimdən
Soyuyan gözəl!

Biganəlik buzu
Könül sındırır,
Ürək soyuqluğu, –
Ürək yandırır.
Ey odlu sevgimdən
Soyuyan gözəl!

*20 aprel 1999*

## ULDUZLARI BARIŞMADI

Ulduzlar göylərdə
Yanan çıraqmı?
Kimsəyə sirrini
Göylər açmadı.
Günəşin haləsi
Qızıllı tağmı?
Sevənlərə ümid verən
ulduzları barışmadı.

Ulduzlar səmada
Çanaq-çanaqdı,
Fəqət üfüqlərdən
Zülmət qaçmadı.
Bahar yerdən uçub
Dağlara qalxdı
Məhəbbətə yol göstərən
ulduzları barışmadı!

Kəhkəşan nurunu
Karvana düzdü,
Vadidə şəfəqlər
Seli daşmadı.
Səma yerdən küsdü,
Yer göydən küsdü;
Doğmaydılar bəlkə qəlbən –
ulduzları barışmadı!

Arzular ucadır,
Arzular sonsuz.
Ümidlər Günəş tək
Üfüq aşmadı!
Ulduzlar taledir,
Talelər ulduz;
Sevənlərin neçin görən
ulduzları barışmadı?

*23–25 aprel 1999*

## ELƏ YAZIRAM Kİ...

Dünyanı qürurla
Məndim düşünən,
Deyirdim öz sözüm –
Öz sənətimdir.
Elə yazıram ki,
Şeri mən dünən.
Sanırdım bu ilkin
Səadətimdir!

Fikir məcraları
Dəyişdi ömrün.
Yalnız dəyişməyən
Xasiyyətimdir.
Elə yazıram ki,
Şeri mən bu gün
Sanıram sonuncu
Vəsiyyətimdir!

*16 mart 1999*

## MƏŞHUR

Zaman vardı məşhur olmaq səadətdi,
O səadət hara uçdu, hara getdi?
Həqarətlə baxıb sənə
Kimsə belə düşünür ki, şöhrəti var,
Demək, varı-dövləti var.

Həris-həris həsəd coşar
Ətrafında dalğa kimi.
Sən qalarsan yad quşların
Arasında fərsiz ala qarğa kimi.
Baxar gözlər qəzəb ilə
                    yanar-yanar,
O, nə bilsin bu gün sənin
                    ciblərində siçan oynar.

O, başqa bir aləmdədir,
Üfüqlərə pərvaz edir.
O, atdığı oxlar bu gün
                    dəymir daşa,
Baxırsan ki, canı yoxdur,
Cangüdəni qoşa-qoşa!
Silahlıdır, yaraqlıdır,
Kim varlıdır, o haqlıdır!

Sənin arzun, öz gücünü
Bir ilahi sözdən alar.
Neçin xalqım belə deyib?
Millət üçün ağlayanlar gözdən olar!
İllər boyu çəkdin millət dərdini sən,
Sən su verdin susuzlara,
Sinə gərdin quduzlara,
Dua qıldın sonsuzlara,
Niyə gəlib yoxsulluğun
                    Gördün axır həddini sən?

Dünən elə sanırdın ki,
Hər kitab bir xəzinədir.
Bu gün isə kitab nədir, şer nədir?
Nəyə lazım bu gün şer insanlara,
Bacarırsan, sən çörək ver, insanlara!

* * *

Məşhur olmaq təhlükədir,
Qara donda ağ ləkədir.
Bəlkə vaxtsız
Geyib ölüm libasını,
Sən,
beləcə verəcəksən,
Qazandığın şöhrətin də bahasını!
Nə gələcək, qoy o gəlsin,
Sən qorxdunsa, sən deyilsən!

Ömür belə çatsa sona,
Qoy desinlər:
O, zamana, zaman ona şahid oldu,
yaşasa da, yana-yana
Soyuq bir qış səhərində,
Ölüm-dirim səngərində
şəhid oldu!

## DÜNYA QOPMUŞDU SANKİ

Nə oldu?
Yuxudan
oyandı birdən,
Dünya qopmuşdumu öz məhvərindən?
O baxdı, zər otaq səssiz-səmirsiz.
(Yatmaqda çoxuna nümunəyik biz!
Çox yatdıq, gül əkib tikanlar dərdik,
Torpağı, qeyrəti güdaza verdik!)
Yoxladı cibini,
cibi bomboşdu
"Bu qədər pullarım bəs hara uçdu?
Görmədim belə dərd
haçandan bəri?"
Yenə axdı onun sərxoş gözləri.
"Gördüyüm yuxu lap yarıda qaldı,
Qoy yatım"...
Yenə o, yuxuya daldı.
Doldu zər otağa əcaib səslər,
Yatdı, bir də dünya qopana qədər.

...Rəqs etdi kazino mələklərilə,
Sonra milyon getdi oyun zərilə.
Bir anda... Var-yoxu
yellər apardı.
Yay günü köksündə şaxtalı qardı.
Ürəyi çırpınan bir quşdu, sanki
Dünya məhvərindən qopmuşdu, sanki.

O, bir də qalxmadı, əbədi yatdı.
Şərəfsiz bir ömrün tez sonu çatdı.

Azğın həyatına dözmədi ürək!
Ancaq səadətdi yuxuda ölmək?!

*26 oktyabr 1996*

## OLDUM

Mən gəncliyin ilk çağında
Gəzdim şeirin çorağında.
Kəhkəşanlar qucağında
Şimşək kimi çaxan oldum.

Yollar rəvan,
          illər karvan,
Mənimkidir, sandım, cahan.
Dəniz kimi dalğalanan
Bulaq kimi axan oldum.

Sevgi gördüm əfsanə tək,
Səcdə qıldım divanə tək,
Öz ömrümü pərvanə tək
Atəşlərə yaxan oldum.

Əhd eyləyən
          Əhdi dandı,
Unuduldu eşqin andı.
Ümid söndü, ürək yandı
Mən ah çəkib baxan oldum.

*24 sentyabr 1996*

## ARILAR BAL ÇƏKİR ŞƏKƏR TOZUNDAN

İnsan yalan ilə üzbəüz çıxır,
İndi bal toplamaq nə qədər asan!
Çiçəklər darıxır, güllər darıxır,
Arılar bal çəkir şəkər tozundan.

Məyər zəhmətilə bal dadır insan?
Nə üçün insanı aldadır insan?

İnsan ürəyini harama versə,
Mütləq tez görəcək ömrün yasını.
İnsan təbiətə qəsd eləyirsə,
Təbiət alacaq öz qisasını.

Alacaq,
        Alacaq...
                    necə alacaq?
İnsanı bəlaya, dərdə salacaq.

Biz də arılarıq, gülsüz, çiçəksiz,
Vədlər şəkərini kim bizə verdi?
Bal yox, acı-acı dərd çəkirik biz,
Doğma torpaq dərdi, el-oba dərdi!

Görən kim deyər ki, bal dadır həyat,
Bizi yalanlarla aldadır həyat!

Dövran öz qəlbini harama versə,
Solmuş görəcəkdir ömür yazını.
Zəmanə insana qəsd eləyirsə,
İnsan da alacaq öz qisasını.

Alacaq,
        Alacaq...
                    necə alacaq?
Yalanı, riyanı taxtdan salacaq!

*27-28 aprel 1996*

## ŞAM YANDI

Dünənmi bu olub,
                    ya min il qabaq?
Birdən alovdilli ildırım çaxdı!
Şamın şöləsinə sığınan otaq,
Yarı qaranlıqdı, yarı işıqdı.

Cahan dinşiyibdir
                    sirli küləyə,
Elə bil hardasa bir kaman sızlar.
...Şam nuru ulduz tək uçurdu göyə
Şam olub enirdi yerə ulduzlar.

Dünya əbədiydi,
                    insan əzəldi,
Əsdi bahar mehi ömrün qışına.
Sanki səcdəsinə Ay özü gəldi,
Qondu haləsiylə şamın başına.

Yağırdı göylərdən
                    nur şəlaləsi,
Necə sehirliydi Ayın haləsi!

Zaman ümmanının dalğalarında,
O nədir parlayan?
                    Zərdir, gümüşdür.
Mən birdən gördüm ki, doğmalarım da
Şamın işığına dövrələnmişdir.

Baxışlar mehriban
                    üzlər tanışdı,
Elə bil, əsrlər dindi, danışdı!
O kimdir, bənzəyir
                    Dağ qartalına?
İz düşür hardansa bu evə kimi.

Babam tumar çəkdi ağ saqqalına,
Kölgəsi divarda bir zirvə kimi!
Ürəyə hərarət gəldi ürəkdən,
Bayırda dünyanın zülməti vardı.
Ovcuyla qoruyub əsən küləkdən,
Anam qonşu evə işıq apardı.

Cahanda müqəddəs
                    olub hər zaman,
Nurundan insana nur verən insan!

Şam yanır, əriyir,
                    şöləsi titrək,
Sönmə şam!
                    Az qalır haray qoparım!
İstərəm həyatda doğmalarım tək
Ürəkdən ürəyə işıq aparım!
Şam söndü...
                    Elə bil bir ömür bitdi.
Qaldı varlığımda isti şöləsi.
Şam söndü... Nə üçün tez sona yetdi
Axşam əfsanəsi,
                    Şam əfsanəsi?

*25 yanvar 1997*

## NAHAQMIŞ...

– Biz cahana – dedin:
Nahaq gəlmədik!
Belə sanıb sevinmək də nahaqmış.
Günə yandı papağımız, bilmədik,
Hər ucalmaq, hər enmək də nahaqmış!

Pənahına gələn şəxsə
demə "yox",
Həqiqətdən əli üzmək, nahaqmış!
Yer üzündə haqq kimə var, kimə yox,
Çıraq ilə haqqı gəzmək nahaqmış!

Ötən illər karvanını sal yada,
Düşünmə ki, gedən karvan nahaqmış!
İnsanı da alıb-satan dünyada
Bəlkə ümid, əhd-peyman, nahaqmış?

Qətrə-qətrə uddun dərdi,
qəmi sən,
Gözlədiyin hörmət belə, nahaqmış!
Əl açmayan bir dilənçi kimisən,
Qazandığın şöhrət belə, nahaqmış!

Dönük dostu sən nə gözlə,
nə ara,
Qəmə batmaq ahıl çağda, nahaqmış!
Mədhiyyələr çevriləndə meyara
Qədirbilən axtarmaq da, nahaqmış.

Sənin şerin haqq adıyla
dinəcək,
Söyləmə ki, yaza-yaza, nahaqmış!
Kitabların başdaşına dönəcək,
Ondan başqa nə vardısa, nahaqmış!

*20 yanvar 1997*

## UŞAQ... CAVAN... QOCA...

...Uşaqsan, sanırsan cahan sənindir,
Bilmirsən dünyada dərd var, əzab var.
...Gəncsən, sevgi sənin, peyman sənindir,
Nədir, sən duyursan hicran, intizar!

...Cavansan, dünyanın gözü səndədir,
Qocaldın, öpməyə yeri, əyil sən!
Cavansan gözəllər dörd dövrəndədir,
Qocaldın kimsəyə lazım deyilsən!

...Yaşlaşdın, yenə də sən coşdun-daşdın,
Qocaldın daha da mehriban oldun.
Ahıllaşdın, qəlbən azca yaşlaşdın,
Qocaldın yer oldun, asiman oldun.

Torpaq qucağında
                    uyusan da sən,
Parladın ulduz tək
                    kəhkəşanda sən.

*24 sentyabr 1997*

## ÜMMAN SAHİLİNDƏ BİR ÜMMAN SEVDA

...Parlaq ulduzları
gözündə gördüm,
Şeri, şeyriyyəti sözündə gördüm.
Təzədən dilləndi, sanki dünyada
– Ümman sahilində bir ümman sevda!

Elə bil, bir şimşək
çaxdı qəlbimə,
İlahi duyğular axdı qəlbimə.
Qayıtdı ömrümə doğma bir səda,
– Ümman sahilində bir ümman sevda!

Nədir istədiyim,
nədir gəzdiyim?
Haqqım varmıdır ki, sevgi gözləyim?
Mən onu görərəm yalnız yuxuda, –
Ümman sahilində bir ümman sevda!

Sənə xoşbəxtlikdir –
diləyim mənim,
Səndə əmanətdir ürəyim mənim.
Parlasın üfüqdə,
coşsun dalğada, –
Ümman sahilində bir ümman sevda!

*13 sentyabr 1997*

## BİGANƏYƏM

Əzab gördüm sevib erkən
Mən də belə divanəyəm.
Mən ehtiyac içindəykən
Var-dövlətə biganəyəm.

Böhtan yazır paxıllarım,
Mən bilirəm özüm nəyəm.
Quyu qazır paxıllarım
Kin-nifrətə biganəyəm.

Nadan qəlbdə qəzəbə bax,
Gərək ona nifrət deyəm.
Eşitdiyim yaltaq-yaltaq
Söz-söhbətə biganəyəm.

Bəlkə də mən bu aləmdə
Yazılmamış əfsanəyəm.
Mən ad-sana yetişsəm də
Şan-şöhrətə biganəyəm.

Qol-budaqlı çinaram mən,
Mərd nəsildən nişanəyəm.
Qorxum yoxdur heç kimsədən,
Güc-qüvvətə biganəyəm.

Qəlbdə coşar sevgi yenə,
Gərək eşqə mən baş əyəm.
Deməyin ki, mən biganə,
Məhəbbətə biganəyəm.

*4 mart 1996*

# SƏNİNÇİN DEYİL

Gözlənməz varlılar
çıxıb ortaya,
Dükanlar açmaq da heç çətin deyil.
Vaxt – kimə gülüşdür, kimə ağlamaq.
"Şöhrətli" peşələr gəlib dünyaya
Onların heç biri səninçin deyil.
Buna əfsus demək yaraşmaz, ancaq.

Kimlərsə bəzənib
zərə-xaraya
Sanki həvəs başqa, zövq həmin deyil!
Geyim kəsik-kəsik, çiyinlər çılpaq.
Əcaib dəblər ki, gəlib dünyaya
Onların heç biri səninçin deyil.
Buna əfsus demək yaraşmaz, ancaq.

Bənzər əsl gözəl
Günəşə, Aya,
Yuxular görürsən, yuxun çin deyil.
Arzun da şimşək tək bir an çaxacaq.
Nə qədər gözəllər gəlib dünyaya,
Onların heç biri səninçin deyil.
Buna əfsus demək yaraşar, ancaq.

*11 aprel 1997*

## NƏVƏM NİGAR ÜÇÜN

Dedim: – Nigar, bax, çaya,
Nigar girdi bağçaya.
Dərdi qəşəng meyvələr,
Düzdü kiçik taxçaya.

Dedim : – Nigar, bax, Aya
Arzularla çıx, Aya!
Gül dərdi Ay nurunda
Nigar taxdı yaxaya!

Dedim : – Nigar, bax, gölə,
Göydən işıq tökülə.
– Göldə qızıl balıq var, –
O dedi gülə-gülə.

Dedim : – Nigar, bax, düzə.
Gülsün nur tək baxt üzə.
Sən özün yaraşıqsan
Göy çəmənə, ağ düzə!

*22-26 oktyabr 1996*

## TUFAN... DƏNİZ... GÜNƏŞ...

(*Mənzərə*)

Coşqun külək əsir qatı dumanda,
Haçaq susacaqdır, bu külək haçaq?
Elə tufandır ki,
                    sanki bu anda
Dəniz məcrasından daşıb çıxacaq!

Bəlkə kömək umur sahillər bizdən.
Qaynadır yağışlar nəhəng dənizi.
Sulara baxırıq pəncərəmizdən,
Sular ayırmışdır sulardan bizi,

Leysan elə tökür,
                    elə tökür ki,
Daha boylanmayır üfüqdən Günəş.
Gündüzə elə bir zülmət çökür ki,
Necə? Qala bilər şəfəqdən Günəş?

Bir nisgil səslənir boz dalğalarda
Çinar gözü yaşlı göyə boylanır.
Mən qibtə edirəm
                    ora ki, orda
Gün çıxıb dənizlər od tutub yanır.

*26–28 sentyabr 1996*

## ÜFÜQLƏR ARXASINDA

Hardasa aclıqla çarpışan insan,
İsti xörək görür öz yuxusunda.
Sanki Ay çörəkdir, Yersə dəstərxan
                    üfüqlər arxasında.

Yoxsulun illəri asta ölümdür,
Gizlənib qaş ilə göz arasında.
Harınlıq bəşərə böyük zülümdür
                    üfüqlər arxasında.

Nemətdir qaçqına bir parça çörək,
Dostuyla bölüşür, o yarısında.
Bundan ibrət alsın insanlar gərək
                    üfüqlər arxasında.

Tale ulduzumuz hey yanar-yanar,
Soluxar göylərin zər yaxasında.
Bəlkə bizlərə də qibtə edən var,
                    üfüqlər arxasında.

Qoy Yer kürəsinin
                    intəhasında,
Hər kəs kama yetsin
                    öz dünyasında,
                    üıfüqlər arxasında.

*3 sentyabr 1999*

## QAYIDAN SEVGİM

Sevgi hirslənərmiş!
Küsüb getdi o.
Ömrümdən yel kimi
Əsib getdi o.

O getdi, zülmətli
Axşamda getdi,
Bir ilin günləri
Çilik-çilikdir.
O, reyhan ətirli
Dünyam da getdi,
Sevgisiz ömür də
Yetimçilikdir.

Axı o haraydı,
Yerlər onsuzdu.
Göydədir?
O axı
Parlaq ulduzdu!

Onu ulduzlarda
Aradıqca mən,
Şəfəqli siması
Göyün üzüydü.
Sandım ki, səmaya
Uça-uça mən
– Sayrışan ulduzlar
Təbəssümüydü.

O, susur, göylərsə,
Gəlirdi dilə,
Qəlbimə hərarət,
İşıqdı axan.
Sanki ulduzların
Nur gözləriylə,

Baxırdı ən uzaq
Qalaktikadan!
Noldu birdən-birə?
İnam da gəldi!
Elə bil quş olub
İlham da gəldi?

Kədərli söz yazdım
Alın tərilə,
Ahlar ürəyimdən
Yüksələn kimi.
O, gəldi mübarək
Qədəmlərilə,
Göylərdən Ay gələn,
Gün gələn kimi.

Sözlər pıçıldadı
O sirli-sirli,
Sehirli səfərdən
Qayıtdı sevgim
Qayıtdı dünyam da –
Reyhan ətirli,
Məni bəd yuxudan
Oyatdı sevgim!

Sevgim, bir də uçub
Getmə, amandır!
Yerin ulduzunu
Yerlərdə yandır,
Bu gün biz ulduzuq –
Sevgi cahandır!

*10-12 yanvar 2000*

## DÖVRAN İSTƏMƏZ...

*Ey Füzuli, müttəsil müxalifdir dövran mana,*
*Qaliba, ərbabı – istedadı dövran istəməz!*
***Füzuli***

O getdi ardınca ilahi səsin,
Sözü əsrin qövsü-qüzehi oldu.
Dövran istəmədi, qoy istəməsin,
Füzuli dövranın fatehi oldu.

O sandı istedad əzabkeşidir,
El dedi: sənətin o, Günəşidir!

Doğma söz dərdlərə məlhəm olarsa,
Eşqi də dənizdir – sahilsiz dəniz.
Yox, yox bizdə əgər istedad varsa,
Qara fəhləsiyik istedadın biz.

O, haqqın yoluyla məğrur gedərkən
Salam rüşvət deyil – deyə susdular,
Bildik bu gün rüşvət tüğyan edərkən
Bizim salama da niyə susdular?

O tənha deyildi tək də qalanda
Eşqin gecələri kədərli, məhzun.
Dövran Füzuliyə qəddar olanda
Biz kimik ki, bizə mehriban olsun?

Dərdlərin əlindən o, dağa çıxdı,
Dedilər: bəxtəvər yaylağa çıxdı.

Biz bir ay yatanda xəstəxanada,
Dedilər ki, yeri isti, rahətdir.
Paxıllıq eylədi paxıl buna da:
– Bəxtəvərin işi istirahətdir!

Dövranlar dəyişir, dəyişir zaman,
Dünənin sirridir – bu günün sirri.
Dünən bir dahini sevməyən dövran,
Bu gün necə sevsin adi şairi?

O getdi ardınca ilahi səsin,
Sözü əsrin qövsü-qüzehi oldu.
Dövran istəmədi, qoy istəməsin,
Füzuli zamanın fatehi oldu.

*21 yanvar 2000*

## BU NECƏ YAŞAMAQDIR

Görən, neçin yaşayıram?
Kimsə görmür göz yaşımı
Ağlayaraq için-için
                    yaşayıram.

Beş-üç misra şeir yazır, yaşayıram
Hər sətirlə qanım sızır, yaşayıram.
Yer üzündə qanlı sellər axan vaxtı,
Qara gəldi şair baxtı.
Dövran niyə qanı udur?
Qansızları əziz tutur.

Başkəsənlər bircə qanı kəsə bilmir,
Baş kəsilir o zaman ki, baş əyilmir.
Əyilən baş gündən-günə ucalacaq,
Bir əyildi, sonra yenə ucalacaq.
Saman altdan astaca su yeridənlər
Keyfindədir, nə ağlayar, nə də inlər.

Yalan – yaltaq bir budağın yarpağıdır,
Hər ikisi nanəciblik yarağıdır.
Yaltaqlığa
Uyan ağa
Duz yüküylə qalxar dağa.
Taleyin də öz işi var,
Hər yoxuşun enişi var.

Yaltaq hər an pusqudadır,
Qara fikri tüstü dadır.
Haçan ağa dağdan uçur,
Bax, yaltağa, necə qaçır –
Təzə ağa
Axtarmağa.

Torpaqlar da, səmalar da
İndi bölük-bölük olub.

Bu dövranda yaltaqlara
Ehtiyac çox böyük olub.
Sabah əgər baş yaltağa
Qoyularsa nadir heykəl,
İnsanlar da baxmaq üçün
Gələr el-el!
Gül-çiçəksiz durar
Miskin abidəsi.
Yerdən qalxar, göydən enər:
Lənət səsi!

*15-18 dekabr 2000*

## ƏJDAHA

Üç doqquz çevrilib
                    üç sıfır oldu,
Bizlər salamladıq bir daha ili.
Pişikdən adlayıb dünən şir oldu.
Bu günsə gəlibdir əjdaha ili.

Biz sinə gəririk
                    daşqın bir selə,
Günlər ömrümüzdən izsiz də keçmir.
Heyvanlar ilbəil dəyişir belə,
İnsanlar görəsən niyə dəyişmir?

Günahkar boynunda
                    min günah qalır,
İnsansa uludur insanlığında.
Xeyirxah yenə də xeyirxah qalır.
Bədxahla nadansa nadanlığında!

İlin çiçəkləri
                    erkən solur ki,
Bir daha boylansın gələn bahardan.
Elə əjdahalar peyda olur ki,
Əsl əjdaha da qorxur onlardan.

Çökür ürəklərə
                    od qarsa-qarsa,
Qəm sevənə düşür, dərd intizara.
Beşbaşlı əjdaham,
                    Hünərin varsa,
Döz, ikiayaqlı əjdahalara!

Yuxusuz gecələr
                    sabaha kimi,
Biz ahlar çəkirik, qəlbimizdə sirr.

Ağzını açaraq əjdaha kimi
Dövran da bizləri güdür birbəbir.
Əjdaham,
Birillik
                    sən bərqərarsan,
Bir başın vurulsa, sən yenə varsan!

Bizim baş kəsilir
                    küt bir bıçaqla,
Dövranda rəhim yox,
                    ağla, ha ağla!
Gəlmisən,
Çəkilsin,
                    qəzavü-qədər,
Qoy xeyir-bərəkət gəlsin izinlə.
Başım sağ qalarsa, o vaxta qədər,
Bəlkə aparasan məni özünlə?

*2-30 yanvar 2000*

## DÖZƏCƏYƏM

Ləpirlərim batdı quma,
İllər dolandı boynuma
Zəncir kimi halqa-halqa.

Qara tufan,
Əsdi yaman,
Arzularım ümman-ümman,
Ümidlərim dalğa-dalğa.

Dünənimdən gəlir səslər,
Anam deyən ulu sözlər
Qulağımda sırğa-sırğa.

Ağlatdı ah, aman məni,
Dözəcəyəm, zaman, məni,
Nehrə kimi çalxa-çalxa!

Məgər ömrüm getdi heçə?
Mən ölmərəm, əgər bircə
Sözüm qalsa xalqa, xalqa!

*22 avqust 1999*

## KİMİ NƏ GÖZLƏYİR?

Ömrün müqəddəsdir
        bircə anı da!
İnsanı yaxşılıq
        gərək tanıda,
Varı-dövləti də,
        zər-zibanı da
Xırman tək sovuran
        külək gözləyir.

Cana atəş düşür
        adi bir sözdən,
Ümid, inam umur
        gözlər də gözdən,
İntizar yol alır
        çaydan, dənizdən
Sevən bir ürəyi
        ürək gözləyir.

Neçin fələk oyaq,
        tale yatıbdır,
Bəlkə də qiyamət
        günü çatıbdır?
Yağla bal içində
        kimsə batıbdır,
Kimsə bircə tikə
        çörək gözləyir.

Yerlərin ürəyi
        yoxsa daşmıdır?
Ömrün aqibəti
        dərd, təlaşmıdır?
Arzuya, ümidə
        ilk sirdaşmıdır

Kimlər ki, göylərdən
kömək gözləyir?
Ey İnsan!
Dünyaya
yaxşı mehman ol!
Kasıbı geyindir
aca həyan ol!
İstər padişah ol,
istər Sultan ol,
Səni də yaxasız
köynək gözləyir!

*10 avqust 1999*

## GÖRMÜSƏNMİ?

Yay, qış çiçək açan ölkə,
Yad ellərdən çiçək alsın,
görmüsənmi?
Əsrə işıq saçan ölkə,
Özü nura möhtac olsun
görmüsənmi?

Həsrətlə çıx, sahillərə,
Orda balıq ölü, diri,
görmüsənmi?
Necə yağır göydən yerə
Yağış kimi qara kürü,
görmüsənmi?

Düşmən tutub bir aləmi,
Nə dəhşətli tufan imiş,
görmüsənmi?
Vədlər gözəl həblər kimi,
Əlac imiş, dərman imiş,
görmüsənmi?

Qara zülmət qatılaşır
Ümid adlı səhəri yox,
görmüsənmi?
Zadəganlar harınlaşır,
Toxun acdan xəbəri yox,
görmüsənmi?

Görməmisən! Əgər dostum,
zəhmət çəksən,
Gəlib bizə qonaq olsan
görəcəksən!

*15 aprel 2000*

## QORXU VƏ CƏSARƏT

Qorxuyla hökm edən
Özü də qorxar,
Qorxar – başı üstdə
İldırım çaxar.

Cəsarət qorxusu
– Acı tufandır.
Qorxu cəsarəti
Daha yamandır!

Ən böyük dəhşətdir
Bilmirmi cahan?
Xalq başçıdan qorxsun,
Başçı da xalqdan?

Artıq itirmişdir
– Xalqın nəyi var?
Başçının vəzifə
İtirməyi var!

Cəsarət qorxusu
Dərdə dözəndir,
Qorxu cəsarəti
Başlar üzəndir.

Nə qədər qatil var
Bekar gəzişir.
Adam öldürməyə
Əli gicişir.

Cəsarət qorxusu
Tufana dönsün,
Qorxu cəsarəti
Günəş tək sönsün!

*16 aprel 2000*

## UZUNÇULUQ

*Yaman uzunçuluq dəb düşüb, yaman,*
*Aman uzunçuluq əlindən, aman.*

Səs düşdü sözlərin
karvan köçünə,
Fikri insanların ürəyi dedi.
Kim uzun danışdı,
demədi heç nə,
Kim qısa danışdı
hər şeyi dedi.

Səddi var hörmətin,
ehtiramın da,
Məntiq uzun sözün
ən qısasıdır.
Qurtara bilməsən
söz tamamında
Uzunçuluq beynin
ilk qisasıdır!

Uludur göy sirri, yer həqiqəti,
Qoy məntiq cövhəri düşməsin artıq.
Gəlin biz dərk edək bir həqiqəti,
Danışan yazıqdır,
dinləyən yazıq!

Bəşər söz dalınca
qalxar dik dağa
Qoruyar səbrini, məhəbbətini,
Kim ki, varıb gedər
uzunçuluğa
Tapdayar insanlıq ləyaqətini.

Deyiblər duz gərək dadınca olsun!
Biz deyək söz gərək dadınca olsun!

Səs düşdü sözlərin
karvan köçünə,
Fikri insanların
ürəyi dedi.
Kim uzun danışdı,
demədi heç nə,
Kim qısa danışdı,
hər şeyi dedi.

*30 dekabr 2000*

## BİR GÖZƏLƏ

Nə ilahi bir görüşdü?
Ürəyimə alov düşdü.
Dodağında saf gülüşdü
Üzü nurlu, sözü nurlu.

Dağ başından duman qopdu,
Sən dilləndin cahan qopdu.
Mən dilləndim tufan qopdu,
Sən qürurlu, mən qürurlu.

Sevgisi az, şeri çoxdur,
Sən ha yalvar, xeyri yoxdur.
Az danışar – sirri çoxdur,
Dil sükutda – ürək dolu.

Gözəl, sönməz bir işıqsan,
Dünyamıza yaraşıqsan.
Şair, nakam bir aşıqsan,
Sən çılğınsan, eşqin ulu.

İki qürur – iki şimşək,
Tökər yağış, əsər külək.
Nəbi, nə sev, nə bəla çək,
Eşqin olub heç uğurlu?

*20 yanvar 2001*

## NƏVƏLƏRİMƏ

*Doğum günümə hədiyyə axtarmayın*

Bir övlad muradsa,
                    biri qanaddır
Uludur eşqiylə, etibarıyla.
Məncə hər ailə bir kainatdır –
Öz Ayı, Günəşi ulduzlarıyla.

Dünyada sizsiniz
                    Dövlətim – varım,
Şirin bir nəğmədir doğma səsiniz.
Bağıran Elgünüm, susan Yanarım,
Siz mənə Tanrıdan hədiyyəsiniz.

Vüsalım – ürəkdən o yana-yana
Çatdırdı hamını haqqın yoluna.

Sonalar gölündən
                    su içib Sona
Nigar – əsrlərdən bizə yadigar.
Ən kiçik Gülarə – hamıya ana,
Onun gözlərində nəslin nuru var.

Bir oğul nəvəmsə,
                    məndən uzaqdır,
Adın dəyişiblər, canı sağ olsun!
Adını o özü qazanacaqdır
Onda deyəcəyəm, üzün ağ olsun!

Mənim çinar boylu nəvələrim, siz,
Mənim arxamsınız, dirəyimsiniz.
Mənim arzu dolu ürəyimsiniz.

Bir gün yatmaq üçün
                    haqq dünyasında,
Sizin çiyninizdə gedəcəyəm mən.
Gedəcəyəm... Fəqət əsrin yazında
Bir yaşıl çinar tək bitəcəyəm mən!

*7-8 dekabr 2000*

## DAŞ DÖVRÜ

Tayfanın başçısı baxır kənardan,
Dağlarda əks edən gur haraylardır.
Əjdaha ağızlı mağaralar da
Sanki ilahidən daş saraylardır.
Bu nədir, hardayam, mən nə gündəyəm?
Yuxuda bildim ki, daş dövründəyəm.

Daş həm bıçaq idi, həm də ki xəncər,
Daşla elə gözəl baş kəsirdilər.

Qonşu mağaralar, qonşu tayfalar,
Cumub bir-birinə tez hayıf olar.

Kiminin toyuydu, kiminin yası,
Qan axır, qəzəbdən odlanırdılar.
Gündüz qızışsa da daş atışması,
Gecə bir tonqalda qızınırdılar.
İgid cavanların səxavətindən,
Kabab tüstülənir maral ətindən.

Bir tayfa qonşuya qələbə çaldı
Mağara qarala-qarala qaldı.
Vəhşətə nifrətçin göylər əyildi,
Dövrəmdə bilmədim vallah nələrdir?
Tayfa millət deyil, xalq da deyildir,
Tayfa ayrı-ayrı qəbilələrdir.
Yuxuda gördüm ki, ən baş tayfanı, –
Bir anda yox etdi əsrin tufanı!

Oyandım yuxudan...
Nə dəhşətdi bu?
Görəsən röyadı, həqiqətdi bu?

Eşit, yalvarıram Allahım, sənə,
Bir də qayıtmayaq tayfa dövrünə!
Səs gəldi:
            Sadəlövh olma bu qədər
Hələ tayfa dövrü gəlməyib məgər?

*23 aprel 2000*

## SƏNİ SEVƏN VARSA...

Sən yeri, sən göyü
Qəlbinlə dinlə,
Səni sevən varsa dünya sənindir.
Sevən yoxsa, barış öz taleyinlə,
Ağrılı-acılı röya sənindir.

Unutma sevgidən
qaça bilməzsən,
Səni sevən varsa, həyat sənindir.
Sevən yoxsa,
Quş tək
uça bilməzsən,
O sınmış, yaralı qanad sənindir.

Çöksə də yoluna
qapqara bulud,
Səni sevən varsa, cahan sənindir.
Səni sevən yoxsa, dənizə üz tut
Orda coşub-daşan tufan sənindir.

Əgər sevən varsa,
sev ürəyinlə,
Yazdığın hər dərdli misra sənindir,
Sevən yoxsa, barış öz taleyinlə
Məcnun tək atəşli səhra sənindir.

*12-19 aprel 2001*

## AYRI SAHİLLƏRİN EYNİ DALĞASI

Ömrün hər ilinə
Bir ümman dedim,
Niyə uzaq saldı bu illər bizi?!
Bir az sən tələssən,
Mən geciksəydim,
Bəlkə ayırmazdı sahillər bizi.

Yaxın bir sevginin
Uzaq nidası,
Ürəyi şimşək tək odlayıb keçir.
Ayrı sahillərin eyni dalğası,
Doğma qəlbimizdən adlayıb keçir.

Gecə şirin-şirin mürgüləyəndə.
Seyr edər ay səni, kəhkəşan səni.
Mən səhər küləyə
"Əsmə" deyəndə.
Kim isə oyadar yuxudan səni.

Qoşa keçərsiniz...
Yaxın gəlmərəm
Mən yoxam...
                    yanında nə zaman o var.
Gözümü qaldırıb baxa bilmərəm,
O isə istəsə, əl də qaldırar.

Keçirsən, quş olub qanadlanıram,
Amma, ucalmağa üfüq çatmayır.
Səni mələklərə mələk sanıram,
O isə qanuni
Bir arvad sayır.

Baxar qibtəyləmi sizi hər görən,
Ya dinər yer ilə
Səma da birgə?

Birgə döyünməyən ürəklər, görən,
Necə addımlayır dünyada birgə?
Gecikmiş arzular aşıb-daşanda,
Baxaram,
Könlümdən al qanlar axar...
Qanunsuz bir nikah qanunlaşanda,
Qanuni məhəbbət
Kənardan baxar...

*1957*

## MEDALLI DİLƏNÇİ

Süzür yarpaqlardan
işıq qıyğacı,
Divarın dibində
kölgələr xal-xal.
Yanında köhnəlmiş
qoltuq ağacı,
Döşündə saralıb
solmuş bir medal.
Bu gün o əl açır
gəlib-gedənə,
Dünənsə ölümlə
o mərd görüşdü.
Ömrünü, canını
fəda edənə,
Bir medal, bir qoltuq ağacı düşdü.
Azadlıq gəzirdi,
özü oldu qul,
Dünəni gözündə
qanlı sirr kimi,
Kiçik dəmir qabda
cingildəyən pul,
Səslənir dəhşətli
bir təhqir kimi.
Əlac yox!
Gözünə çöküb dumanlar:
Çağırma gəncliyi,
axı hədərdir!
Yanından biganə
ötür insanlar,
Ötənlər medalsız dilənçilərdir.
Axı can üstədir
bir azman ölkə,
Ölkə də dilənir,
görürsən özün.
Axı, qoltuqlara sığınan ölkə,

Özünə bir dayaq
                axtarır bu gün.
Ölkə də, zaman da batıbdır yasa,
Ölkə də sıxmayır səni bağrına!
Qoca! Başqa şeyə
                gücün çatmasa,
Qoltuq aqacından
                dirək ver ona.

*1991*

## SUSMAQ... DANIŞMAQ...

*Dilim-dilim olasan, dilim!*
***Xalq sözü***

Xasiyyət – həm fəxrim,
həm də ki, dərdim,
Dünyada mənimlə
o – qoşa qonaq,
Zəvzəklər yanında
susa bilərdim,
Rütbələr önündə
susmadım heç vaxt!
Keçdim qürurumla
mən qışdan, yazdan,
Əynimə atəşli
bir köynək geydim.
Dara çəkilsəydim
əgər boğazdan,
Yenə öz sözümü
mən deməliydim.

Haqsızlıq gördümsə
yandım, alışdım,
yenə həqiqəti,
haqqı danışdım.
Ulu müdriklərin
dilimdə adı,
Çünki ilahidir
ali həqiqət,
Cavid də, Müşfiq də
axı susmadı,
Fəqət susdurdular
onları, fəqət!
İnsanlar ucalır
uzaqlığından,

Mərd sözü – ədalət
çağırışıdır!
Kim deyir danışmaq
azadlığından
Susmaq azadlığı
daha yaxşıdır?

Qoru qürurunu,
bəşər oğlu sən,
Özün həqiqətə
işıqsan, nursan!
Sadələr yanında,
susa bilərsən,
Rütbələr önündə
niyə susursan?
Gərək ki, haqsızlıq
dönsün hədəfə,
Əyilməyin sonu
acı lənətdir!
Yerində danışmaq
bəlkə qələbə,
Yersiz susmaq isə
məğlubiyyətdir!

*9 sentyabr – 6 oktyabr 1999*

## TUR DAĞINDA

Uzaq ellər gördüm
yaz çağında mən,
Sanki əbədiyyət yoluyla keçdim.
Əyilib müqəddəs Tur dağında mən,
Qədim bir bulağın suyundan içdim!

Dövrəmi almışdı
güllər, çiçəklər,
Mən vida demişdim kədərə, qəmə,
Vadidən məlhəm tək əsən küləklər
Sərinlik yayırdı mənim qəlbimə.

Bulud sıralandı
başımın üstdə,
Məni od, Günəşdən qorumaq üçün.
Torpaq nə arzuda,
göy nə həvəsdə?
Sanki möcüzələr günüydü bu gün!

Vadi uğuldadı...
Titrədi səslər...
– Əgər peyğəmbərsən sən su ver bizə!
Artıq hədəqədən çıxırdı gözlər:
– Susuz cəhənnəmdir göylə yer bizə!

Bu an rəhmə gəldi
ulu Yaradan,
Tur dağı büllur tək fəvvarə vurdu.
İçib vadi boyu axan sulardan
İnsanlar Tanrıya duaya durdu.

Çox baxdım yerlərin
sirli izilə,
Mənə arzuladı kimsə yaxşı yol!

Ey ulu Allahın iradəsilə
Bəşərə su verən Tur dağı var ol!
Zaman düşən deyil,
                    Köhlən atından,
Qovuşdum bu sirrin mənasına mən.
Uzaq möcüzələr kainatından
Qayıtdım həqiqət dünyasına mən.

Bu gün əbədiyyət yoluyla keçdim,
Bəşərə su verən bulaqdan içdim.

*6 may 2001*

## MÜKAFATIMDIR

Mükafat nə qızıl, nə də dəmirdir,
Mükafat inamım, etiqadımdır.
Qiyməti nə xanlar, xaqanlar verir,
Xalqın bircə sözü mükafatımdır.

Ağır cığırlardan astaca keçdim,
İllər zirvə-zirvə xatiratımdır.
Dərin bulaqlardan acı su içdim,
Olsun, bu da mənim mükafatımdır.

İlhamın qədrini bilmədim bəzən,
O mənim küsəyən köhlən atımdır.
Ulduzlar qoynunda ulduz tək süzən
Sonra dönüb gələn mükafatımdır.

Gəldim şerə eşqin etibarıyla,
Dedim sənət mənim kainatımdır.
Qəlbdədir günəşi, ulduzlarıyla,
– Mənim kainatım mükafatımdır.

*18 may 2000*

## ƏLƏKBƏR YANINDA YATAN ƏLƏKBƏR

(*İndi onun otuz beş yaşı tamam olmalıydı*)

*Yerlərdə, göylərdə sevinc duyuldu,*
*Mənim atam adlı bir oğlum oldu.*

Nə böyük hikmətsən
Yer üzərində,
Ömrümə yeni bir səhifə açdın.
Zamanın al-əlvan çəmənlərində
Sanki kəpənəkdin parladın, uçdun.

Sənə həsrətlidir
cığır da, iz də,
Zərli qanadlarla bir də gələydin.
Kəpənək uçarmı mavi dənizdə?
Dalğalar üstdə də gözümə dəydin.

Harasa uçurdum
Qışın qarında,
Elə ki, təyyarə buludu yardı,
Sandım ki, təyyarə qanadlarında
Bir zərli kəpənək qanad çalırdı.

Bu gün də sızlayır
Dərdi dünənin,
O dərd mənimlədir son nəfəsdə də.
Kəpənək dediyim ruhundur sənin
Uçur yerdə, göydə, başımın üstdə.

İllər necə gəlib
keçdi qatarla,
Çağırdım, köksümdə susdu harayım.
Baxıram şəklinə mən saatlarla,
özündən doymadım, şəklindən doyum?

Gözlər kədərlidir, gözlər qapqara,
Baxışlar söz açır sirli mənadan.
Dərdə, əzablara, haqsızlıqlara
Nə qəmli baxırsan sən haqq dünyadan.

Haçan gələcəyəm
yanına sənin?
Tənha ağlayıram mən için-için.
Çox vaxt and içirəm canına sənin,
Sən ki, yaşayırsan yenə mənimçin.

İllərdir yetiməm
Oğul, burda, mən,
Sən ana yanında yetim deyilsən.
Həsrətəm bir səsdən,
soraqdan ötrü,
O gedər-gəlməzdən nələr gözləyək?
Mən də yetimliyi atmaqdan ötrü
Sənin görüşünə tələsim, gərək.

Səsini duyuram
yellər əsəndə,
Səsinlə isinir duyğularım da.
Sən ki dörd yaşında vaxtsız getsən də,
Otuz beş yaşlısan yuxularımda.

Gəlirsən yuxuma –
ürəyi dolu.
Deməyə nə sözlər seçmisən, bala?
Gəlirsən yuxuma boylu-buxunlu,
Boyda atanı da keçmisən, bala.

Dərdimi bilmirsən
Oğul, məyər sən?
Atan da dünyada günləri sayır.
Cənnətdən gəlirsən
Baxıb görəsən,

Atan cəhənnəmdə necə yaşayır?
Ağır yollar keçdim...
Nə ömürdü bu?
Günlər ulduz kimi sayrışan oldu.
Gəldi iki qardaş –
Ələkbər, Arzu,
Xanıma, Gülüşə yaraşan oldu.

Necə mübarəkdi
Qədəmləriniz,
Bu gəliş yandırıb-yaxdı düşməni.
Körpə budaqdınız bir çinarda siz,
Budaq şaxələndi, yaşatdı səni.
Sənin məsumluğun
Sənə sipərdir,
Almısan qoynuna Günəşi, Ayı,
Kəhkəşan belində qızıl kəmərdir,
Ağ atla süzürsən kainat boyu.
A bala, atını ehmalca sür sən,
Mən səni görmurəm, sən ki görürsən!
İki otuz beşi
Adladı atan,
Fəqət səninlədir yenə aləmdə.
Bu gün yer üzündə coşsa da tufan,
Bir zərli kəpənək uçur dövrəmdə.

*Mart 1995*

## ŞİMŞƏK İŞIĞINDA ŞAM EYLƏYƏRKƏN

*Bu il birinci dəfə bağa gəldik. Hava çox sakit idi. Birdən tufan qopdu, qasırğa başladı. Şam etməyə oturanda evimizin işığı da söndü.*

Partlayıb bir anlıq,
                Odlu çay kimi,
Üfüqdən-üfüqə axırdı şimşək
Şığıyıb buluddan yanar ay kimi,
Gözümüz içində
                çaxırdı şimşək.
Büllur aynabəndə çırpdıqca külək.
Süzdü şüşələrdən naxış-naxış su,
Nəhəng bir nağara çubuqları tək
Döydü damımızı göy gurultusu.
Bir an parlaq işıq...
                Bir an zil qara,
Böyük möcüzəydi kiçik süfrəmiz.
Çörək boyanırdı mavi bir nura,
Udurduq o nuru tikə-tikə biz.
Torpaq cəfasını çəkirdi göylər,
Axı yeri tamam
                çirkab götürüb.
Selləri, suları tökürdü göylər.
Yerin çirkabını
                yumaqdan ötrü.
Bu necə su idi, necə seldi ki,
Ona həsrət çəkdik
                Biz gecə-gündüz.
...Mənə birdən-birə elə gəldi ki,
Oturub bizimlə kimsə üzbəüz,
Şimşək sönən kimi, o da sönürdü,
Şimşək çaxan kimi o görünürdü.
Elə şəffafdı ki, üzü, bədəni.
Ağappaq saçları
                haləsi nurdan.

İsitdi, İlahi, baxışlar məni,
Qəlbə qürur axdı məhrəm qürurdan,
Bir də işıq saçıb
İldırım söndü.
Nurani qonağım
Xəyala döndü.
Qonağım!
Nə dindi,
nə də yedi o.
Bizim günümüzü
Gördü də getdi.
Elə kainatın sahibiydi o,
Bizə xeyir-dua verdi də getdi.
Hər an gəzdiyimin tez yetdi sonu,
Hanı o nurlu üz, o nurlu şimşək!
Bir də bu dünyada
Görmərəm onu,
İndi o dünyaya tələsəm gərək!

*1991*

## ŞAİRƏ HÖRMƏT

*Bizdə olar şairə hörmət öləndən sonra!*
***Ə.Vahid***

Elə ki, səninçin soldu son bahar,
Elə ki, dost-tanış geyindi qara,
Dövrəndə irişən paxıllar ki var
Daha olmayacaq öləndən sonra.

Uçarkən ucadan ucalara sən,
Artıq heç bir kəsə rəqib deyilsən!

Elə ki, axışdı el dəstə-dəstə,
Birdən çatılacaq rəqib qaşları,
Gələcək kədərlə tabutun üstə,
Axacaq gözündən timsah yaşları.

Deyəcək: "Əcəldə insaf olmadı,
Görün qansız ölum nə vaxtsız gəldi.
Sındı şerimizin qolu-qanadı".
Qəlbindən keçəcək: – "Yaxşı ki, öldü"
Susacaq arxamca min söz düzənlər,
Onlar nə idi ki? Qara bir kölgə,
Şerinə göz yumub, dodaq büzənlər
Səninçin haray da saldılar, bəlkə.
"Ucaldaq adını ləyaqətlə biz,
Yoxsa nankor deyər bizə nəslimiz".
Kədər ümman oldu, sevincsə qətrə,
Nə tapdın dünyada?
Acı bir şöhrət.
Sənət aləmində həsəd və qibtə,
Yuxarı zümrədə sükut və hiddət.

Qoy tale tapşırsın Allaha səni,
Qoy ikinci ömür gəlməsin qara.

Fəqət unutma ki, bir daha səni,
Öldürə bilərlər öləndən sonra.
Sən ki daş illərlə durdun üz-üzə,
Düşün kimlər çatdı sənin dadına,
Sabirin adına dalan düşdüsə,
Sənin bir döngə də düşməz adına.
Qorxunc həqiqətdən əfsanə umma,
Təskinlik – inamdır, göydə, yerdə var.
Vəfasız dünyadan sən heç nə umma,
Hələ canlı ikən ölənlər də var.
Yaşadın həyatda sən ki özün tək.
Bəlkə bu özü də bir səadətdir?
Dəhşətdir ölümdən əvvəlcə ölmək,
Öləndən sonra da ölmək dəhşətdir.

*2 aprel 1995*

## ŞEYTANIN ETİRAFI

Tərsinə axır zaman,
Artıb dərdim, qubarım.
İnsan çıxıb yolundan,
Kimi yoldan çıxarım?

Əllərim hara yetər?
Gözləri kor atım var,
Hamı şeytandan betər,
Mənim quru adım var.

Suya zəhər qatırlar,
Zəhərə dönüb həyat!
Şəhərləri satırlar,
Necə deyim "yurdu sat"!

Kim mənə qulaq asır?
Haraylarım səssizdir.
Dünya şeytan dünyası –
Əsl şeytan işsizdir.

Sevirmi dövran bizi?
Danlamağı tərgitdi.
İşə bax, insan bizi
Rüşvətə də öyrətdi.

Haqladın uçmuş yolu,
Yol verməyə nə var ki?!
Havayı gələn pulu
Bol verməyə nə var ki?

Harınlıq evlər yıxıb,
Onlar qan da tökürlər.
Elə şeytanlar çıxıb
Mənə papış tikirlər!

Dillənir torpaq, səma,
Barmaqlar var,
gördün qaç!
Heç mənim barmağıma
Yoxdur daha ehtiyac!

Məni görməzsən, İnsan,
Biryolluq burdan getdim.
Bu şeytan dünyasından,
Mən şeytan, həzər etdim!

*23-24 noyabr 1996*

## BİR DAŞ ALTDAN, BİR DAŞ ÜSTDƏN

*Dediklərimizi bir də xatırlayaq.*

Noldu mənim "zəfər" – deyən ümidlərim,
Dünənimə üz tuturam mən bu gündən.
Erkən soldu çinarlarım, söyüdlərim,
Daşaltıda haray çəkdi şəhidlərim,
Bir daş altdan,
Bir daş üstdən.

Qara neftim sərhədləri necə aşdı?
Dəllallarsa pərdə asdı gözümüzdən.
Açılmayan yolları da dollar açdı,
Benzinimiz özümüzə alov saçdı.
Bir daş altdan,
Bir daş üstdən.

Şuşa, Laçın satqınlığa qurban getdi,
Qanlı əllər çiçək dərdi dağdan, düzdən,
Qeyrət dedik – bu, görəsən nə qeyrətdi?
Düşmən qızıl Kəlbəcəri talan etdi.
Bir daş altdan,
Bir daş üstdən.

Qırıldıqca yaşıl-yaşıl ormanlarım,
Həqiqəti biz gizlətdik özümüzdən.
Kimə çatdı bu ahlarım, amanlarım?
Susdu göydə güllələnib yananlarım.
Bir daş altdan,
Bir daş üstdən.

Küçələrdə əl açaraq ağlayan kim,
Biz baxarıq, qanlar axar könlümüzdən.
Milyonları yad ölkədə saxlayan kim,
Kazinolar guşəsində bank qoyan kim.
Bir daş altdan,
Bir daş üstdən.

Onlar bilməz ürəklərdə nə haraydır!
Ah hərislik! Nələr doğdu bu mərəzdən?
Qürbət eldə villa nədir, saray nədir,
Keyf çəkməyə bir həftə nə, bir ay nədir?
Bir daş altdan,
Bir daş üstdən.

Doğma xalqım gör nə qədər əzab çəkdi?
İmtahanmı edir bizi zaman qəsdən?
Bir gün zəfər qapımızı döyəcəkdir,
Millət deyib, tarix özü deyəcəkdir;
Götür daşı daşın üstdən,
Həqiqəti görsün Vətən!

*5–15 sentyabr 1996*

## NECƏ ADAMLAR VAR

Bağlanıb pul kisəsinə,
Kimlər düşüb tələsinə?
Gələr aqil məclisinə
Meydan sulaya-sulaya.

Yaxşı bilər hesabını,
Özü yazar kitabını.
Böyüklərin yal qabını,
Silər yalaya-yalaya.

Ona rüşvət qapı açdı,
Harda aşdı, orda başdı.
Sərvət başdan aşdı-daşdı,
Xalqı talaya-talaya.

Yoxsullara dərsə durar,
Zənginlərlə bəhsə durar.
Rütbəlilər görsə durar,
Quyruq bulaya-bulaya.

Həris insan,
Bir an dayan!
Bəlkə yuxudasan, oyan!
Ulu sözünə baxmayan
Qalar ulaya-ulaya.

*31 mart 1996*

## HALAL ŞÖHRƏT

Şöhrət kiminçinsə kölgəyə bənzər,
Həmişə, hər yerdə izləyər onu.
Fəqət halal şöhrət dünyanı gəzər,
Kimsə məzarda da gözləyər onu.

Nələrə sahibdir sənət sahibi?
O yanır, deməyə sözü çatmayır.
Sabaha nur saçır şöhrət sahibi,
Saçdığı nurasa özü çatmayır.

Kim ki məddahlıqla şöhrət qazandı,
Durur dar ağacı önündə, sanki.
Kim ki vicdan satıb sərvət qazandı,
Doğulub ölür o, hər gündə, sanki.

Dinlə, nələr deyir əsrlər sənə,
Yerlərin, göylərin həqiqətindən.
Çatdı Yunis İmrə öz şöhrətinə
Altı yüz illiyin kor zülmətindən.

Ötüb Nəsimi də altı yüz ili,
Atını qürbətdən Vətənə sürdü.
Beş əsr keçərək dahi Füzuli
Gəlib heykəlini Bakıda gördü.

Qəribə talelər olur dünyada,
Hər izdə möcüzə, hər addımda sirr.
Tarix iki əsri yola salsa da,
Vazehin şöhrəti hələ yol gəlir.

Şöhrət kiminçinsə kölgəyə bənzər,
Həmişə, hər yerdə izləyər onu.
Fəqət halal şöhrət dünyanı gəzər,
Kimsə məzarda da gözləyər onu.

*23–24 noyabr 1996*

## ÇEÇEN QARDAŞ

Eşit məni, çeçen qardaş!
Torpaq üçün öz canından keçən qardaş.
İmperiya alovundan
kənddən kəndə köçən oldun,
Qəfil ölüm zəhərini
sən mərdanə içən oldun.
Bəli, kimin ürəyində torpağına
sevgi varsa, o böyükdür,
Məgər kiçik xalq olurmu?
O xalqdırsa, o böyükdür!
Mətin durdun, batmamaqçın
sən rəzillər girdabına,
Bu gün sənin adın düşdü
əsrin qeyrət kitabına.
Xalq ölçülmür miqdarıyla,
Xalq ölçülür vüqarıyla.
Xalq ölçülür dəyanəti, qeyrətilə,
Bir də dosta məhəbbəti,
bir də yada nifrətiylə!
Qeyrətsizə can əzizdir,
qeyrətliyə ana torpaq.
Bayraq daha uca qalxdı
boyandıqca qana torpaq!
Sənin yurdun öz qanını
torpaqlara qatana da vətən oldu,
Mənim yurdum torpağını
satana da vətən oldu.
Vəzifəsiz müdrikə də,
vəzifəli nadana da vətən oldu.
İgidliyin çoxlarına
bu gün verdi ibrət dərsi,
İbrət dərsi, qeyrət dərsi!
Bax, dağılmış imperiya
vəhşiləşib yaralanmış ayı kimi,

Ölüm səpir, dərd paylayır,
qəm gətirir hər qədəmi.
Beş il əvvəl Bakımızda
Mən görmüşəm bu qədəmin qan izini,
Mən görmüşəm xalqın qəzəb dənizini!
Bu gün mənim ana yurdum
min-min şəhid torpağıdır,
Şəhid yatan xiyabanlar
əbədiyyat ocağıdır.
İmperiya! Caynağından
qanlar sızan İmperiya!
Azadlığa həsrət xalqa
ölüm yazan İmperiya!
İllər boyu kor olub biz,
"Böyük qardaş" dediyimiz
İmperiya!
Harınladı dərimizi soya-soya İmperiya!
Özü cəllad, sözü riya, İmperiya!
Ürəyində yer üzünə
Hökmranlıq iddiası,
Bu deyilmi qudurğanlıq iddiası?
Qucağında bəslədiyi özü kimi
Cinayətkar gədası var,
O dərs verib gədasına,
Layiq olsun atasına,
Bu gədanın məkr dolu,
riya dolu ədası var.
Onunçun da "dənizlərdən dənizlərə"
xülyası var.
Azərbaycan millətinin
amalı haqq, işi haqqdır.
Düşmənlərin ədası da,
xülyası da gözlərində qalacaqdır.
Sonsuz yasla bitəcəkdir
imperiya təntənəsi,
Mən indidən eşidirəm

xarabələr üzərində bayquş səsi.
Ulu Rəbbin qəzəbilə
əvəzini o alacaq,
Dağıldıqca dağılacaq.
Ondan mənhus ad qalacaq!
Sən ey doğma torpağıyçın
öz canından keçən qardaş!
Bu gün qəlbim, varlığım da
səninlədir, çeçen qardaş.

*25–26 fevral 1996*

# ƏBƏDİYYƏTDƏN GƏLƏN SƏSLƏR

*Həzrət Əlinin "Qısa kəlamlar"ını oxuyarkən...*

Tanınar kim nə vaxt danışıb dinər:
İnsan öz dilinin altda gizlənər.

– Övlada tərbiyə nə vaxtdan başlar?
– Söylə uşağının neçə yaşı var?
– Bir yaşa az qalıb.
– Onda, eşit, bil,
Artıq gecikmisən sən tamam bir il.

– Eyblərin böyüyü nədir söylə bizə sən?
– Özündə ola-ola başqasında gəzəsən.

– İnsançın azadlıq qurtarar haçaq?
– Sən vəd verənədək azadsan ancaq!

Məzluma verdiyi əziyyət üçün
Zalıma məhkəmə qurular bir gün.

Həqiqət acıdır – fəqət dərmandır,
Yalan şirindirsə – əfi ilandır.

Yaxşılıq ki, insanlığın borcu olubdur,
Pislik ilə qalib gələn özü məğlubdur.

Vəfasıza vəfa mehri salan kimi,
Sən Allaha vəfasızsan.

Vəfasıza vəfasızlıq elədinmi,
Sən Allahın qarşısında günahsızsan.

Tamah zülmətli yoldur,
Tamahkar əbədi quldur.

Kim ki, yer üzündə dostu itirib,
Odur yer üzündə ən böyük qərib.

Dünyada ən ulu sərvət ağıldır,
Dünya da nadanlıq üstdə dağıldı.

Aclıq vaxtı mərd insandan uzaq ol,
Toxluq vaxtı sən nadandan uzaq ol!

Kimlər ki, çox danışdı.
Səhvi də başdan aşdı.

Aqillərin sinəsi,
Min sirrin xəzinəsi.

Daşı daş atana özün culaşdır,
Çünki daş atanın cavabı daşdır.

Xəlvəti günahdan qəlbi çəkindir.
Günah – sənin aşkar bir şahidindir.

Bir şəxsin ki, qapısını bağlayasan,
bəs ruzusu necə gələr?
– Gələr... gələr o yerdən ki, əcəl gələr.

Sözü deməmişdən – söz sənin qulun,
Elə ki, söylədin – özün qul oldun.

Söz var, bir əbədi kitaba dönər,
Söz var, ömür boyu əzaba dönər.

Ali gözəlliyi duymayan kordur,
Ağarmış tükləri qoparma, nurdur!

Həyatın əbədi həqiqəti var,
Əvvəl yol yoldaşı, sonra yol axtar!

İnsanı ağılmı, dilmi tanıdır?
Bil ki, dil ağılın tərcümanıdır.
Əgər cahillərdən uzağa qaçsan,
Onda aqillərə qovuşacaqsan.

Kim ki, öz qədrini bildi dünyada,
O, insan qorxusuz öldü dünyada.

Yaxşılıq pisliklə qoşa gedəndir,
Minnət yaxşılığı batil edəndir.

Dünyada yuxuya gedir insanlar,
Ancaq ölüm vaxtı oyanır onlar.

Kimlər, zəmanəyə sədaqət etdi,
Zəmanə onlara xəyanət etdi.

Üzürlü, üzürsüz söz var, günahdır,
Üzrü təkrar etmək, təkrar günahdır!

Yalan olan yerdə məhəbbət olmaz,
Məhəbbət yoxdursa, sədaqət olmaz,

Sən, həris oldun,
Möhtəris oldun.

Məkriylə hiyləsi gizli olan kəs.
Elə düşməndir ki, dost ola bilməz.

Məhəbbəti səslə sən
Ki, özün seviləsən.

Kim özündən razıdır,
Arzuya tamarzıdır.

İki şey məhv edər mütləq hər kəsi,
Yoxsulluq qorxusu, mənsəb həvəsi.

Malını, canını qardaşa saxla,
İnsaf, ədalət də düşmənin olsun.
Hamıya gülərüz bax, yaxşılıqla,
Xalqın salamları qoy sənin olsun!

Dünya və axirət –
iki düşməndir.
Birinə çatdınsa,
o biri gedir.

Əmanəti sahibinə
Qaytar dünyada,
O, Peyğəmbər övladına qatil olsa da.

Sadiqlər sərvəti ətək-ətəkdir,
Xəyanət yoxsulluq gətirəcəkdir.

Kinli adamların
Dərdi böyükdür!
Ədavət qəlb üçün
Ən ağır yükdür.

Daim öz qəlbini
Yeyər paxıllar.
Uca uçmaq istər –
Uçar yıxılar.
Paxıl səltənəti birdən dağılar.

Səbr etmək ən böyük bir şücaətdir.
Əvvəli nəcabət, sonu cənnətdir.

Kim özgəyə böhtan deyir,
Öz-özünü ləkələyir.

Unutma ki, padşahların az bəxşişi şərafətdir,
Fəqət alçaq adamların çox bəxşişi həqarətdir.
Həsəd aparmayın!

Bu sirdir, məyər?
Od özü odunu yaxıb kül eylər?
Əgər mömin şəxsə
Dərdini desən,
Mərhəmət görərsən sən ki Allahdan
Nəbadə kafirə gileylənəsən,
Şikayət edirsən, sanki Allahdan.

Əgər şərəfini itirsə bir kəs,
Ata şərəfi də köməyə gəlməz.

*May–iyun 1992*

## ARAZ SAHİLİNDƏ CAVAN BİR GƏLİN

Qonşu harayından
yer titrəyirsə,
Burdan baş götürub gedim hara mən?
Göylər fəryadımı eşitməyirsə,
Niyə yaşayıram bundan sonra mən?

Ümidi yerlərdə,
göylərdə gəzdim,
Dünyanın dərdləri doldu ürəyə.
Ərim şəhid oldu, mən yenə dözdüm,
Oğlumu igid tək böyüdüm, – deyə.

Eşit məni, Xan Arazım,
Səsi mehriban Arazım.
Qəlbim kimi sularında
Axır qara qan, Arazım.

Dünən qapımızda onlar ki quldu,
Bu gün bağ-bağçamı qana boyatdı.
Evimə od vurdu erməni quldur
Körpə oğlumu da odlara atdı.

Nə oldu bilmədim, hara qaçdım mən,
Göz yaşım sel oldu soyuq meşədə.
Qanlı alovlarla yer-göy yanarkən,
Saçlarım ağardı bircə gecədə.

Sərhədim bir qızıl
üzüyə dönsə,
Arazım üzüyün büllur qaşıdır.
Namusu, isməti itirməkdənsə,
Sənin qucağında ölmək yaxşıdır.

Mən üz tutum hara, sular?
Bəyaz sular, qara sular.

Qoy atılım qucağına,
Saçlarımı dara, sular!
Qoy dünya eşitsin, haray qoparım,
Bədbəxt taleyimdə sən varsan mənim.
Ya bu gün mən səndə
                    məzar taparam,
Ya da xilaskarım olarsan mənim.

Cavan Araz, qoca Araz,
Gəldim uça-uça, Araz.
Eşqim kimi sən dərinsən,
Qürurum tək uca, Araz.

Arazım, mən sənə açdım dərdimi,
Çatdır o sahilə bu gün sağ məni.
Günəş suda qızıl yelləncək kimi,
Bəlkə də o taya atacaq məni.

Meşədə səhərə çıxdım birtəhər,
Boğuldu köksümdə ahım, harayım.
...Vəhşilər görüblər...
                    odur, gəlirlər.
Al məni qoynuna, a doğma çayım,
Qurbanam boyuna, a doğma çayım.

...Dil deyib ağladı titrək ağaclar
Üzüb görəcəkmi o doğmaları?
Səpildi sulara ağarmış saçlar,
Daha da ağartdı ağ dalğaları.
Örpəyi havada,
                    quş kimi uçdu,
Uçub o sahilə
                    qondu dan üzü.
Dalğalar bu taydan o taya coşdu,
O taya çatdımı gəlinin özü?

*3 noyabr 1993*

# KƏRBƏLADA

*İmam Hüseyn məqbərəsi*

Qızıl qapılardan astaca keçdim,
Elə bil əsrlər dindi, danışdı,
Görəsən mən bura haçan gəlmişdim,
Axı yer də, göy də mənə tanışdı.

Qədim astanadan adlayan kimi,
Üstümə çil-çıraq leysanı yağdı.
Gümüş barmaqlığa sürtdüm əlimi,
Qəlbimə bir doğma hərarət axdı.

Qovuşur insanlar günəş selinə,
Üzlərə nur qonur, şəfəq enirdi.
Müqəddəs məqbərə önündə yenə,
Ürəklər saflaşır, təmizlənirdi.

Nə yüksək qübbədir güzgülü tavan,
Göylərdən ucadır dinim, imanım.
...Bu an yumşaq bir əl tutdu qolumdan;
Səs gəldi "Oyadır xəlqi əfqanım".
Mən ulu sözlərin sehrinə düşdüm,
Bu odur, İlahi, o doğma səsdir.
Bu səsi neçə yol mən eşitmişdim,
Yer kimi, göy kimi o, müqəddəsdir.

Dedim, a gözlərim, nə bəxtəvərsən,
Gör kimi görürsən bu gün səhər sən,
Mehriban baxışlar, nurani sifət...
Doğma məhəbbətlə qoşa alışdıq.
Bu bir xəyal idi, yoxsa həqiqət?
Biz sükut içində belə danışdıq.

– Azəri yurdunda de, nə var oğlum?
– Təcavüz, xəyanət, satqınlıq, ölüm.

– Satqınlıq? Əcəba, nələr satılır?
– Bu gün kənd satılır, şəhər satılır.
Duydum qəlbə düşdü onun təşvişi.
Gördüm ki, üzünə çən, duman gəlib.
– Axı mərd olmuşdur xalqım həmişə.
Bu cürə satqınlıq bəs hardan gəlib?
– Şairim, and olsun Günəşə, Aya,
Bu bir həqarətdir dərd elər bizə.
Elə bir dövrdə gəldik dünyaya,
Satqınlıq dərsi də verdilər bizə.

"Rüşvət deyil deyə" o vaxtı səndən,
Salam almadılar.
                    Bu ki, dəhşətdir.
Satqınlıq rüşvətə dönüb kökündən,
Əsrimin özülü elə rüşvətdir.

Rüşvət qüvvətdir ki, tamam üzdədir,
Əlindən tutacaq o qüvvət sənin:
Millət vəkili də milyon üstədir,
Vəzifə sənindir, şan-şöhrət sənin.

Mən də seçkilərdə səsə qoyuldum,
Aldatdı insan da, şeytan da məni.
Dili acı oldum, cibi boş oldum,
Sağdan da vurdular, soldan da məni.

Rüşvətxor kefdədir bu gün həyatda,
Pulun qanadıyla göy üzündədir.
Sevgi duyğuları ayaqlar altda,
Şəhvani hisslərsə göz üstündədir.

Gözəllik alınıb satılan zaman,
Vəhşiyə dönməzmi dünyada insan?
Əyər şairsənsə,
                    nə düşün, nə yaz.

Şerin qiymətini verən tapılmaz.
"Dərd çox... həmdərd yox"
                    Bu ömür nədir?
Ev-eşik dərdidir, çörək dərdidir.
Bu yandan da dava.
– Dava, kiminlə?
– Zülmətlər övladı kor Əhrimənlə.

Qonşu qan içəndir, qonşu alçaqdır,
Bu dava iynəylə gor qazımaqdır.
Leylilər can verir döyüşdə, ancaq,
Gəl cəbhədən qaçan Məcnunlara bax.

Qalxdı mərd oğullar Vətənim, – deyə,
Zadəgan övladı evində yatdı.
Əlsiz-ayaqsızlar getdi cəbhəyə,
Əlsiz-ayaqsız da geri qayıtdı.

Yenə kəsilməmiş torpaq alveri,
Nə qədər qaçqın var...
                    El dözmür daha.
Ahımız tutubdur göyü və yeri,
Ümid Allahadır, yalnız Allaha.
Babamın üzündən qəzəb yağırdı:
– Bunları eşitmək mənə ağırdır.
Müqəddəs məqbərə parlayır par-par,
Üstündə cahanın işıq selimi?
Yanında bir kiçik
                    məbədgah da var,
Günəşlə yanaşı,
                    Ay olan kimi.
– Burda yetmiş iki şəhid uyuyur,
Gedib din yolunda qurban igidlər.
– Xalqım da onlara dua oxuyur,
Amma minlərlədir bizim şəhidlər,
Vətən fədaisi cavan igidlər.

Onunla müqəddəs yerdə görüşdüm,
Qəm ürək telini çəkdi tarıma.
Tanrım, nə sehirli aləmə düşdüm,
Tanrım, bu sehirdən məni ayırma.

...Birdən gözlərimdə gur işıq söndu,
Mən onu səsləyən sonsuz harayam.
Mehriban baxışlar xəyala döndü,
Ecazkar dünyada gördüm tənhayam.
Qəlbimdə ah çəkdi solan arzu-kam:
– Söylə, hara getdin Füzuli babam?!
Hanı o vüqarım, o fəxrim, hanı?
Yenə də bir haray gəzdi dünyanı:
"Muradım şəmi yanmazmı?"

*7 dekabr 1992*

## QANLI YANVAR

Yermi batdı, göymü uçdu
Sökülәndә qırmızı dan?
Yer kürәsi iki rәngdәn yoğrulmuşdu –
Qara ilә qırmızıdan.

Üfüq gümüş, torpaq qızıl,
Neftimizlә varlananlar.
Görün necә qaytardılar haqqımızı.
Döz, ürәyim, döz, ürәyim!

Pәncәrәmә gәlib qonan günәş, aydı.
Muğamatın sәdaları
Әsrlәrin ağısıydı.
Ürәklәrә sәbir dedi, dözüm yaydı,
Döz, ürәyim, döz, ürәyim!

Dinlәdikcә bircә anlıq
Dәhşәtlәri unudursan.

Sağ ol, mәnim muğamatım,
Ey varlığım, ey hәyatım,
Tarixlәrin qucağından
Yenә gәlib әllәrimdәn sәn tutursan.
Döz, ürәyim, döz, ürәyim!

* * *

Oğul cәsәdini tapmayan ana,
İndi dә şәhәri ağlar dolanır.
Sanki dәrd әlindәn
                    gәlib tüğyana,
Dünyanın başına dağlar dolanır.
Bir gәlin – körpәsi
                    imanı, dini,

Yudu uşağının ağ köynəyini
Zivəyə sərməkçin eyvana çıxdı,
Tuşlandı gəlinə qatil gülləsi.
Evdə haray çəkdi körpənin səsi,
Yerə mərcan-mərcan al qanlar axdı.
Ölümə mərdanə
getdi cavanlar –
Qızardı göy rəngi asimanın da.
Əgər bir məcrayla
axsaydı qanlar,
Xəzər yaranardı
Xəzər yanında.
İnsan iradəsi
dəmir olsa da.
Zirehli tanklara
göylər dünyada?
Gör necə bənzərdir –
biz bunu gördük.
Qara əməllər də qara gecədir.
Düşmənlər gəlsəydi
sinə gərərdik,
Bəs "dost" dediyin nə,
bu qırğın nədir?
Matəmə boyanmış doğma evim var,
Kədərim sonsuzdur, səbrim möhtəşəm.
Mənim silahım yox,
tək qəzəbim var,
Güllə bir yol atar,
qəzəb həmişə!
Neçə-neçə cavanların toy gecəsi,

Dönüb oldu vay gecəsi.
Qara geymiş anaların
Yaş qurudu gözlərində.
Qızıl-qızıl kəcavələr
Üzdü şəhər üzərində...

O gün fəda etdi
mərdlər baxtını,
İzdiham yarıldı xiyaban kimi.
Ulduz-qərənfilli
insan axını,
Düzüldü yer üstdə
kəhkəşan kimi.
Sahildə dalğalar
coşdu, çağladı,
Gəmi harayıyla
Xəzər ağladı.
Dünyanı çulğayan
fəryad səsidir,
Bundan hali edin
gedib-gələni!
Zəlzələ təbiət faciəsidir.
İnsanlar gətirdi bu zəlzələni.
Anaların ahı,
mərdlərin qanı,
Yerdə qalmayacaq
heç zaman, heç vaxt!
Məgər ki, sabahın
məğrur insanı,
Qatil boğazından
yapışmayacaq?!
Qonur hər məzara
göyün ulduzu,
Necə ağır olur gecə matəmi...
Kim deyir dünyada
şəhidlər susur?!
Şəhidlər dillənir
şahidlər kimi
"Ey qanlı yanvar,
Əlində qan var.
Nə qədər torpaq var,
göy, asiman var,

Sən elə qanlısan,
ey qanlı yanvar.
Nə qədər rica et, nə qədər yalvar,
Səni bağışlamaz el, "qanlı yanvar".

* * *

Allah, sanki birdən zaman dayandı,
Gördük neçə vəhşi ölümü, Allah.
Al qandan torpaq da
od tutdu, yandı,
Sən necə götürdün bu zülmü, Allah!
İnsan doğma yurdda
sanki qəribdir,
Qanlı fəlakətin
susmur fəryadı.
Kim ki, ölümlərə fərman veribdir,
Bu gün necə görən o, rahat yatır?
...Deyirlər, qaranlıq çökəndə yerə,
Astaca yarılır şəhidlər qəbri.
Sükutla gedirlər onlar evlərə,
Səhər sükutla da dönürlər geri.
Allah, şəhidlərim ölməz, müqəddəs,
Nuru məzar üstdə yandıran sənsən!
Sonra da əl tutub dinməz-söyləməz,
Onları evlərə aparan sənsən.
Onlar asta keçir çəndən, dumandan,
Boynuma dolanmır qolları əfsus,
Onlar ki, hər şeyi görür cahanda,
Biz isə görmürük onları, əfsus!
Yenə çıxsın günəş,
parlasın ulduz.
Necə tapdalandı ədalət, qanun!
...Ərşə çəkilmişdir bizim yuxumuz,
Siz ana torpaqda rahat uyuyun!
Bizim vicdanımız,

Qeyrətimiz siz,
Sizə səcdə edir bir ulu millət!
Şəhidlər sizsiniz,
                    şahidlərsə biz,
Rəhmət oxuyuruq sizlərə... rəhmət!

*20 yanvar – 4 fevral 1990*

# OĞUL TOYU

*Unudulmaz Gülarə üçün*

Bu qış isti gəldi,
Bu necə qışdı?
Hayıf, görmədin.
Arzuya toy etdik,
Dünya axışdı,
Hayıf, görmədin.
Bir gözüm ağladı,
Bir gözüm güldü,
Hayıf, görmədin.
Çoxdan gözlədiyin
Gəlinin gəldi,
Hayıf, görmədin.

* * *

Cahan göylərində şimşək çaxsa da,
İllər qəmli gəlib,
kədərli getdi.
Bir Arzu ulduzu
doğdu dünyada.
Dünyada bir ümid çiçəyi bitdi.
Bir gün qovuşmaqçın tale ulduzu,
Bir ömür yol keçdi ümidlə Arzu.
Qəlbinə süzülən
Nurlu üfüqlə
Arzu addımladı ulduzum, – deyə.
Göylər çəmənindən axan şəfəqlə,
Ümid də səsləndi gəl, Arzum, – deyə,
Çalan kim, gülən kim,
toy qızışmışdı.
İçəridə bahar, bayırda qışdı.
Birdən yer üzündə sirli yel əsdi,

saçımda əl gəzdi,
İstidən isti.
Milyon əl içində o doğma əldi,
Sehirli dünyadan sehirlə gəldi.
Necə darıxmışdım
O əllər üçün,
O əldən süzülən
Nur sellər üçün,
Sən elə baxırdın,
Gülümsəyirdin.

Deməli, bu gün də
sənsiz deyildik.
Sən oğul toyunda
dua deyirdin.
Bu toyda, düyündə
Sənsiz deyildik.
Yağırdı bayırda qar səpə-səpə,
Oğlunun, gəlninin üzündən öpən,
Sən ki, özündün!
Toya işıq saçan sanki özündün.
Nurlu baxışların
Dünənki kimi,
Bizi ayırmayıb elə bil aləm.
– Niyə ağlayırsan, – deyirdin, – Nəbi,
Axı mən burdayam,
mən səninləyəm!
Gəl birgə oynayaq, göz yaşını sil,
...Açdın qollarını, qanad tək açdın.
Bir rəqs burulğanı
qopdu elə bil,
Ömrümdə heç belə
oynamamışdım.
Oldun müsafiri
Sən bircə anın,
Getdin, dərdin, qəmin sorağı qaldı.

Sanki arasında
iki dünyanın
Sönməyən bir işıq
zolağı qaldı.
O zolaq sehirli
nərdivan kimi,
Çəkirdi göylərə mənim qəlbimi.
Gəldin oğul toyu
Arzusunda sən,
Sirli dəqiqələr,
geri qayıdın!
Bəlkə əbədiyyət yuxusunda sən,
O gecə ilk dəfə rahat uyudun.

*1990–1992*

## VƏSİYYƏT ƏVƏZİ

Bütün doğmalara
                    üz tuturam mən,
Ömür də gəmi tək çatır sahilə.
Məni kəndimdəki
                    ata evindən,
Özünüz aparın axır mənzilə.
          Doğma çiyinlərin
                    ucalığından,
          Son dəfə görüm ki,
                    sonsuzdur cahan!

Yolları kitab tək
                    varaqlamışam,
Ötüb kəşməkəşdə illəri ömrün.
Gözdən yaş axmayıb
                    mən ağlamışam,
Heç kəs ağlamasın mənimçin o gün.
Gedin asta-asta,
                    dalğın, pərişan,
Ağırdır yerimək ağır tabutla.
Dərd böyük olanda
                    danışmaz insan,
Sükutla dayansın, hamı sükutla.
                    Sükutla çatdırın
                    murada məni,
Sükutla danışsın matəmli gözlər.

Yığıb sağlığımda
                    boğaza məni,
Boğazdan yuxarı deyilən sözlər.
          Hardansa bir tütək
                    səsi eşidim.
          Dillənsin, o kövrək
                    səsi eşidim.

Şəfəqlər ucadır,
kölgələr qısa,
Tabutum üstünə günəş əyilsin.
Əgər ölümümə sevinən olsa,
Qoy o da gəlsin.
Gəlsin, üzü tutqun,
səsi də titrək...
Elə düşünsün ki,
o ölməyəcək!

Qayıtsın geriyə
mükəddər axın,
Qəmli il gəlməsin yaşınız üstə.
O axşam
üfüqə
diqqətlə baxın,
Bir ulduz yanacaq başınız üstə.
Göylərin o uzaq
zərrin ulduzu,
Sizə səs verəcək səssiz-səmirsiz.
Min yol baxdığınız
həmin ulduzu
Elə bil ilk dəfə görəcəksiniz.
Nuruyla hər qəlbə
çatacaq ulduz,
Batanda Xəzərdə
batacaq ulduz

Durnalar,
Uçacaq
sonra qatarla –
Siz gəlib bir çinar basdırın yerə.

Ucalım torpaqdan
mən o çinarla,

Dayanıb doyunca
baxım Xəzərə.
Eşidim,
hardasa
tütək səslənir,
Bəlkə də
Susmayan
ürək səslənir.

*1982*

## SİZ EY NİZAMİYƏ ƏL QALDIRANLAR

*"Harda daş qəlbli var, –*
*Nadan, avam, naşı var".*
***Nizami Gəncəvi, "Sirlər xəzinəsi"***

Qədim Dərbənd torpağında
Bir şaxtalı qış çağında.
Gəldi nadan, görmədi ki,
Yeri, göyü zülmət sarır.
Yaxınlaşıb oğru kimi,
O, bu anda bilərdimi?
Nizamiyə əl qaldıran
Peyğəmbərə əl qaldırır.
Bir heykəl ki, əsrlərin
Qucağında tutub qərar,
Bir nadanın əlləriylə
Məyər onu yıxmaq olar?
Hardan gəldi avam, nadan,
Neçin belə durdu qəsdə?
Bu an Fərhad dağı çapıb
Səpələdi nadan ustə
Göy elə bil parçalanır,
Yer elə bil titrəyirdi.
Bəhram Gurun Gur səsindən
Qanlı qatil titrəyirdi.
Yox, abidə yıxıldımı
O daha da uca qalxdı,
İskəndərin qılıncından
Birdən odlu şimşək çaxdı.
Yerə, göyə alov saçdı,
Nadan qaçdı,
Gördü gəlir arxasınca
Bir çağlayan atəş çayı.
Odlu çayda çırpındıqca,
gəlib çatdı Xəzərə o,

Öz qəlbini parçaladı
öz harayı.
Görən zülmət bir gecədən
Sağ çıxdımı səhərə o?
Sağ qaldısa, gecə-gündüz
alovlanıb o yanacaq
Yuxusundan od içində oyanacaq.
Bir dəfə də o göz yumub,
Görəcək ki,
Cəhənnəmin odundadır,
Dahilərə əl qaldıran
Cəzasına mütləq çatır.
Bu gün ulu Nizaminin
Səcdəsinə aləm gəlir,
İnsanlığı insanlığa
Haraylayan
gur səsinə aləm gəlir.
Sabah isə dönüb sönməz
Günəşə o,
Yenə məğrur gələcəkdir
doğmalarla görüşə o,
Tər güllərin, çiçəklərin
qucağında,
Ucalacaq doğma Dərbənd
torpağında.

*20-21 fevral 1993*

## PEYĞƏMBƏRİN DEDİKLƏRİ

Bir gün bir məclisə
Gəldi Peyğəmbər,
Vurdu titrək-titrək
Köksündə ürək...
Başladı tərifə onu görənlər,
Danışdı ağızlar köpüklənərək.
Şit tərif ləkədir –
Qara bir ləkə –
Düşündü, qəlbində ildırım çaxdı.
Qəzəblə dinlədi tər tökə-tökə,
Peyğəmbər onlara diqqətlə baxdı.

Peyğəmbər astaca qalxdı ayağa,
Dilləndi üzündən qəm yağa-yağa,
– Mənim əməllərim
Allah əmridir,
Mən icra edirəm, Allah əmr edir.
Sizdə tariflərə bu nə həvəsdir?
Rəbbim deyir: Qoru öz hörmətini!
Kəsin, yığışdırın, qurtarın, bəsdir,
Bu dil rüşvətini, söz rüşvətini.
Budur həqiqət:
Əgər ləyaqət
Qalxsa da göylərin yeddi qatına,
Rüşvət salar onu ayaq altına.
Gözü kölgəlidir hər vaxt cahanda,
O rüşvət verən də, rüşvət alan da.
Siz onu vicdana qoymayın yaxın,
Sakın ey ümmətim, rüşvətdən sakın!
Bilin qoruduqca səmimiyyəti –
Daha dəhşətlidir bu söz rüşvəti!

...Birdən ürəklərdə duruldu sular,
Könüllər elə bil nura büründü.

Nəcib bir məcraya axdı duyğular,
Artıq təriflər də xəyala döndü.
İnsanlar üz tutdu
Göylərə sarı:
– Kaş ki, belə olsun həmişə Tanrı!

*12 mart 1995*

## KƏLBƏCƏR HARAYI

*Şair dostum Şamil Əsgərova*

Çökdü vadilərə bir qara kölgə,
Hay ver, köhnə dostum,
bu gün hardasan?
Ağlayır ürəyin yaş tökə-tökə,
Yurdun viran qaldı,
özün hardasan?
Vaxtsız vida dedi dostlar cahana,
Batdı əzəmətli dağların yasa!
Başsağlığı vermək?
dil gəlmir buna,
Baş necə sağ olsun,
yurd dağılıbsa...
Göylərə dirənir
el ah-naləsi,
Yay kimi gərilmiş əsəbim bu gün.
Sənsən yada nifrət mücəssəməsi,
Mən də qəzəb oğlu qəzəbəm bu gün.
Kədər ümmanında təlatüm sonsuz,
Ürək müsibətə dözməyir daha.
Niyə sədaqətin qiyməti ucuz,
Niyə xəyanətin qiyməti baha.
Qızıl tək kimlərin cibinə gedir,
Güllə atılmamış satılan torpaq.
Dövrün ən dəhşətli müsibətidir,
Yadlar torpağına qatılan torpaq.
Yurdumun görəcək günləri varmış,
Kəndlər də, evlər də
şəhid olarmış!
Göy meşə, gur dəniz, ağ zirvə bizə,
Verilib Tanrıdan
əmanət kimi.
Kim ki əmanətə xəyanət etsə,
Sayılsın ən böyük cinayət kimi!

Torpağı suladı
igidlər qanı,
Cinayət məlumdur,
cani bəs hanı?

* * *

Qocaman Murovun uca qoynundan
Qəmli karvan köçür,
dağıl, a dünya!
Məğrur dağlarımın İsti suyundan
Buz qəlblilər içir,
dağıl, a dünya!
Yurdu viran olmuş Dədə Şəmşirin,
Qəbri tapdalandı,
dağıl, a dünya!
Yerin faciəsi göylərdən dərin,
Yer də, göy də yandı,
dağıl, a dünya!
İgidlər sığınır həmişə haqqa,
Haqqı, ədaləti görür Tanrımız.
Dünyada şəhidlər verən bir xalqa,
Ən əvvəl ölməzlik verir,
Tanrımız!

* * *

Şerinlə, qəlbinlə
dostum, hər zaman
Sən ana Vətənin hayına çatdın.
Özü təbiətin
muzeyi olan,
Doğma Kəlbəcərdə muzey yaratdın.
Muzey də talandı,
haray, ay haray,
Odlara qalandı,
haray, ay haray,

Ölüm öləcəkdir!
                    Yaşayır həyat!
Cəlladın qoy tuncdan zirehi olsun!
Sabah Kəlbəcərdə
                    bir muzey yarat,
Qanlı cinayətlər muzeyi olsun!

* * *

Sən ey faciəli,
                    qayğılı xalqım,
Qəzəbli dərya tək çalxalan, bu gün.
Heç kimə güvənmə,
                    ey ulu xalqım,
Sən özün-özünə arxalan, bu gün.
Tarixin dolanbac yollarıyla sən,
Həmişə vüqarla,
                    qalib keçmisən!
Mərd sözünü de hər kəsə,
Öz qüdrətin sənə bəsdir!
Torpaq azad edilməsə,
Azadlıq da quru səsdir!
Qışa düşdün yaz vaxtında,
Sənin işin, sözün haqdır!
Zəfərlərin zər taxtında
Baş tacımız Azadlıqdır!

* * *

Çökdü vadilərə bir qara kölgə,
Hay ver, köhnə dostum, de,
                    sən hardasan?
Ağlayır qəlbimiz yaş tökə-tökə,
Cənnət viran qaldı,
                    Dillən, hardasan?

Sabah dönəcəyik o yerə hökmən,
Dağları dağlar tək
                    görəcəyik biz!
Al-əlvan Kəlbəcər çiçəklərindən
Zəfər çələngini
                    hörəcəyik biz!

*1993*

## XEYİR VƏ ŞƏR

Dünya burulğanlar
dünyası olub,
İzləyir hər yerdə dəhşəti dəhşət.
Bəlkə Xeyirlə Şər birgə doğulub
Birisi işıqdır, birisi zülmət!

Niyə çalxalanır
yerlə asiman,
Bəlkə əsrin itən etiqadıdır?
Xeyir – İlahidən gələn ərməğan,
Şər isə şeytanın kor övladıdır!

Xeyir ümman qədər,
Şər qətrə kimi,
Qətrə rəngdən-rəngə bürünər bəzən.
Dünyaya gəlsə də, ifritə kimi
Şər – mələk cildində görünər, bəzən.

Görünər... o girər
İnsan qəlbinə,
Möcüzə yaradır fələk, – deyərsən.
Pıçıldar bəzəkli yalanlar sənə,
Nə çoxdur cahanda mələk, – deyərsən.

Tutar gözlərini
qatı bir duman,
Bir qılınc baş üstdə asılıb durar.
Şər – hünər taxtına əyləşən zaman,
Xeyir – həyasına qısılıb durar,
Xeyir – əridəcək
zülmət qışını,

Böyükdür Xeyirin səbri özü tək.
Bəşər gözləyir ki, Şərin başını
Xeyir ümidiylə haçan əzəcək?
Qoy bağlansın göyə,
                    yerə insanlar,
Bəşər qaranlıqdan çıxsın işığa!
Havadar olmasa Şərə insanlar,
Xeyir – tez yol açar xeyirxahlığa!

*21 dekabr 1996*

## QƏRİBƏ HƏQİQƏT

Gah coşar, gah susar, gah titrər səsi,
Özü də sirlidir əməli kimi.
Üzdə o mütilik mücəssəməsi,
Arxada cəsarət heykəli kimi.

Özünə xoşdurmu öz aqibəti?
İtən ləyaqətdir yaltaq xisləti.

Bəllidir, son hökmü ədalət verir,
Xasiyyət qopmayır öz təməlindən.
Dövran yaltaqlara var-dövlət verir,
Fəqət mənliyini alır əlindən.

Yaltaqlıq üstündə ucalan ömür,
Xalqın ürəyində lənətə dönür.

Yaşar səksəkəli, əsər ürəyi:
"Başqası özünə birdən yer elər".
Onunçun yaltaqlar, qorxaqlar təki
Bir gündə min dəfə ölüb-dirilər.

Yaltaq yaltaqlara qəzəblə baxar,
Göz qızdı, ömründə təhlükə bilməz.
Yaltaq tikən evi –
          Yel asan yıxar.
Yaltaq yıxan evi –
                    el tikə bilməz.
Yaltaq – göy çinara
          çürük calaqdır.
Yaltaq öləziyən qara çıraqdır.

Rütbəli kəslərlə xoşdur qılığı,
Rütbəsiz kəslərə rişxəndlə gülər.
Yaltağa uyanın peşmanlığı
Tərif şərbətindən doyanda gələr.

Bu bəlkə qəribə həqiqətdir ki,
Sözü açıq dedin nifrətə dönür.
Yaltaqlıq mənəvi bir rüşvətdir ki,
Əvəzi min-milyon rüşvətə dönür.
...Gün batdı, qaraldı göy aram-aram,
Ay da ki buludsuz havada parlar.
Əcaib bir yuxu gördüm bu axşam,
Gördüm ki, yaltağa heykəl qoyurlar.

Durdu başım üstə qapqara kölgə,
Möhkəm basdırıldı torpağa heykəl.
"Dünyada heykəl var təlxəyə bəlkə,
Qoy ilkin ucalsın yaltağa heykəl".

Eynək gözlərində, kitab əlində
O, birdən dayandı sual şəklində.

Axı ləyaqətdən məhrum oğullar
Əyilib-əyilib donqar olurlar.
...Çığrışdı Xəzərdə ağ qağayılar,
Oyandım...
          Ey yuxu,
                    Ey kabus çəkil!
Bu gün başdan aşır dərdlər, qayğılar,
Gördüyüm yaxşı ki, həqiqət deyil.

Min tufan əssə də,
          Biz yenə varıq,
Tutsun gur səsimiz
          Bütün aləmi.
Allah, yad düşmənlə biz bacarırıq,
"Doğma" düşmənlərdən qoru ölkəmi!

*Oktyabr – noyabr, 1994*

## AĞDƏRƏ

Doğrudan nə qədər güclüymüşük biz,
Vədlər ümmanında qəşəng üzürük.
Necə də möhkəmdir gör iradəmiz.
Şuşa əldən gedib, hələ dözürük.

Sanırdıq elə bir qan eylərik ki,
Günəş qarşısında durmaz qaranlıq.
Demə, elə nadir tacirlərik ki,
Dəyər-dəyməzinə torpaq satırıq.

Yandı Xocalıda torpaq da, daş da,
Namus üfüqünə düşdü qara iz.
Gəzir günahkarlar yuxarı başda.
Hələ də günahkar axtarırıq biz.

Batdı qızıl qana qarlı Ağdərə!
Ordakı hər qarış göz bəbəyimdir.
Necə haray çəkir burda dağ-dərə,
O qanlı harayı eşidən kimdir?

Ürəkdə Vətənin qeyrəti varsa,
Gərək ölüm üstə biz ölüm saçaq,
Xalqın torpağını kim qaytararsa,
Xalqın inamını o qaytaracaq.

*19 fevral 1993*

## QARANLIQ TUNELDƏN KEÇƏN QATARAM

Yola üz tuturam mən aram-aram,
Gözümdə gur işıq parlayıb sönür,
...Qaranlıq tuneldən keçən qataram,
Köksümdə neçə yüz ürək döyünür.

Kimə ümid verib, nur verirəm mən,
Deyirəm ümidsiz cahan olmasın!
Görüşlər aparıb gətirirəm mən,
Görüşlər əbədi hicran olmasın!

Hər insan ömrü də elə qatardır,
Can atır dünyanın xoş saatına,
Yer üstdə nə qədər faciə vardır,
Keçdi faciələr yerin altına.

Odlu haray çəkib yansa qatarlar
Qatarlar haraya haray qatarlar.

Cinayət! Özünə insan deyənlər
Dərdə dərd calarmı ağır zamanda?
Axı, yer-göy ağlar – yol gözləyənlər
Boynunu əbədi büküb duranda?

Yer göyü, göy yeri qarğışlayarmı?
İnsan ümidini insan kəsdimi?
Ulu Allahım da bağışlayarmı
Yerin yerə olan ölüm qəsdini!

Nə vaxt bu suala cavab taparam;
Niyə yer altına yer üstü düşmən?
...Qaranlıq tuneldən keçən qataram,
Bəs haçan işığa çıxacağam mən?

*21 yanvar – 4 fevral 1996*

## DƏHŞƏTLİ DƏRS

Səhər tezdən durub yuxudan ana,
Belə dərs deyirdi öz uşagına.
– Bu gün biz səninlə gedirik birgə,
Qızım, üzümüzə gün doğdu, bəlkə.
"Çörək pulu verin bədbəxt yetimə!"
Əl aç, bu cür söylə, incə səsinlə!
– Mən yetim deyiləm!
– Yox, elə demə!
Ay qız, ağıllı ol, ananı dinlə!

Qız baxır, bədəni əsdikcə tir-tir.
– Dünya amansızdır, neyləyək, qızım!
Atan altı aydır maaş gətirmir,
Deyirsən, acından biz ölək, qızım.
Xəstə atanı da sıxır dərd, qubar,
Sənin səndən kiçik qardaşın da var...

Axşam qayıtdılar pərişan, yorğun,
Onlarda dilənçi xisləti varmı?
– Ağzına su alıb sən niyə susdun,
Səndən ev dərdinə qalan olarmı?

Kədərlə dilləndi qız aram-aram,
Qəlbdə yuva salmış dərd ki, ələm ki...
– Ana məcbur etmə! Mən bacarmaram!..
– Həyat məcbur edir, mən etmirəm ki...

Yenə küçələrə yollandı onlar,
Hərə fağır-fağır durdu bir tində.
Gəlib şəstlə keçdi boynu yoğunlar –
Quruyub bulağı səxavətin də.

Qız yenə dinmədi, sakitcə durdu,
Baxırdı hər ötən nadan harına.
Onun səsi çıxmır, qəhər boğurdu,
Yağış qarışırdı göz yaşlarına.

İslanıb yağışla,
Donub küləklə,
Onlar evə döndü bircə çörəklə.

Yenə də sabahın qorxusuyla qız,
Yatağa uzandı üz-gözündə tər.
Uçdu bir aləmə yuxusuyla qız,
Çörəklər görürdü, isti çörəklər.

Şimşəklər yağdırdı göy şaraq-şaraq,
Sanki qanad çaldı məşum yarasa.
Titrətmə, qızdırma qucaqlaşaraq
Çəkib aparırdı qızı harasa.

Sanki ağ kəfəndi, ağ buludlar da
Günəş çiçəyiydi nur saçaq-saçaq.
Qız elə aləmə uçurdu, orda,
Bir daha heç kəsə əl açmayacaq!

Elə bil hay qopdu
Düzdə, dərədə,
O, quruyan çaymı, uçulan dağmı?
Təhqirli bir dərsi öyrənməsə də,
Bu dərd kimlərəsə dərs olacaqmı?

Qapqara bəlalar,
Yağır qar kimi,
Donduq soyuğundan dəhşətli dərsin.
Qoy durub ən böyük günahkar kimi,
Bu dərsə cavabı zəmanə versin.

*18-19 may 1995*

## GÖZƏL VƏ GÖZƏLLİK

*Zaman yola salır gəlib-gedəni,*
*Əsrlər ötüşür yuxular kimi.*
*Söz var, gözəl doğma, ay anam məni,*
*Ay anam gözəl doğ, mənim bəxtimi.*
***N.Xəzri***

Günəş kainata nur göndərir ki,
Yerdə gözəlliklə o bəhsə dursun.
Təbiət gözələ qürur verir ki,
Qüruru gözəllər gözəl qorusun!

Gözəllik yaranıb əzəldən əzəl,
Gözəllik əzizdir baş taclarından.
Qoru qürurunu, a nadir gözəl,
Sakın, sən gözəllik hərraclarından.

Qadını qürurla gözəllik bəzər,
Bu haqqın sözünü nədimlər dedi:
Namus doğuluşdan büllura bənzər,
Şüşə qab ya sındı, ya cingildədi!

Dinsin məhəbbətdə kim səmimidir,
Kəsilsin, bulaşsa çirkaba əllər.
Gözəllik müqəddəs mehrab kimidir,
Tanrı, toxunmasın mehraba əllər,
O, qaba əllər!

İstəsən dünyadan sədaqət istə,
Sədaqət sönməsin yanar şam kimi.
Cumar bəd nəzərlər gözəllik üstə,
Milçəklər şirəyə daraşan kimi.

Nədir yaxın eldə, uzaq diyarda
İsmətə ləkələr düşür qapqara?
Dəhşətdir gözəllik yad qucaqlarda
Dönürsə göyümtül əsginaslara.

Niyə varaq kimi tale çevrilir,
Niyə oyuncağa dönür gözəllik?
Gözəllik bir dəfə ənam verilir,
Fəqət əbədilik sönür gözəllik.

Çəkil, gözəllikdən iyrənc əl, çəkil,
Qoru gözəlliyi, Tanrı, amandır!
Bəlkə də günahkar, günahkar deyil,
Bəlkə də günahkar buna zamandır!

Bəlalar yağış tək yağan dünyada,
Yalanlar çevrilib həqiqət olub.
Gündə min cinayət doğan dünyada,
Bəlkə gözəllik də fəlakət olub?

*4-14 mart 1996*

## SƏTTAR MÖCÜZƏSİ

*Səttar Bəhlulzadənin 85 illiyinə*

Təntənə, dəbdəbə...
Parlaq çilçıraq...
Təriflər sel kimi aşıb-daşırdı.
Bunlar səslənsəydi neçə il qabaq,
O, bəlkə neçə il artıq yaşardı.

Günəşi görmədi qamaşan gözlər,
Bəzən xeyri qurd tək yedi şər, əfsus!
Dahi öz vaxtını səbrlə gözlər,
O vaxt da çox vaxtsız yetişər, əfsus!

Kimsəyə bənzəmir ulu insanlar,
Məhəl də qoymayır düşmənə, yada.
Əsrini bir əsr qabaqlayanlar
Haçan qiymətini alıb dünyada?

O zərif vücudda igid qüdrəti, –
Çinarlar nəğməsi, dağlar səsidir.
Biz niyə gec duyduq, Səttar sənəti
Əsrin səkkizinci möcüzəsidir.

Əlvan çəmənlərdə çağlayan çaya
Öz ürək dərdini o danışarmış.
Təbiət yeddi rəng verib dünyaya
Sən demə, bir Səttar rəngi də varmış.

Görərdi cahanı o müdrik gözlə,
Ona xəyal sonsuz, aləmsə dardı.
Sadə uşaq kimi, bir şirin sözlə,
Bəzən ürəyini almaq olardı.
Qeyri-adilik də ilk adilikdir,
Müdriklik ən böyük bir sadəlikdir.

Vətənin rəngləri –
o təkrarsızdır,
Asanmı onlardan söz açmaq, asan?
Səttar sənətini seyr etmək azdır,
Gərək, diz çökərək səcdə qılasan.
Rəng-rəng alovlandı köksündə ilham,
Nəciblik toxumu əkdi cahanda.

Tək şəkil çəkmədi
dərd çəkən rəssam
İnsan taleyini çəkdi cahanda.
Özü yaşasa da zülmət içində
Yağdı fırçasından nur leysanları.
Ömrünə xəzəllər libas biçəndə
Tutdu gül-çiçəyə asimanları.

Qibtə gülləsini tuşladı nadan,
Ömrə zəhər qatdı hər qəlbi qara.
Parlaq kəhkəşana ucalan insan
Sığmazdı o fəxri xiyabanlara.

O, bəlkə müqəddəs arzuya çatdı
Öz ana kəndinə sığındı yatdı.

Qədim Abşeronu candan sevərdi,
Düşdü küləklərin sirr kəməndinə.

Kəndi öz oğlunu sənətə verdi,
O da əbədiyyət verdi kəndinə.
Adi kənd deyildir indi kənd daha,
Dönüb nəsillərçün ziyarətgaha.

Min-min şam yandırıb o şölə çəkdi,
Xəzərdən köksünə axdı dalğalar.
Çinarlar üstündən coşan küləkdi,
Məgər ki, küləyi saxlamaq olar?

Sanki onun ruhu bir ağ göyərçin,
Bir gün qanad açdı uça göyərçin.
Səpdi yer üzünə, o ziyasını
Sönməyən işıqdır, susmaz səsdir o,
Deməyin dəyişib öz dünyasını,
Hər iki dünyada müqəddəsdir o.

*Dekabr, 1994 – yanvar, 1996*

## BULAQ BAŞINDA

(*Yallı*)

– Keçdim çölü, çəməni
Gəzdim könül sevəni,
– Mən də ilk dəfə səni
Gördüm bulaq başında.

– Arzum, eşqim səmimi,
Sən parladın gün kimi.
– Sənə sevən qəlbimi
Verdim bulaq başında.

– Bilirəm diləyini,
Gəl sıxma ürəyini.
– Məhəbbət çiçəyini
Dərdim bulaq başında.

– Su verdin udum-udum,
Su verdin söndü odum.
– Dəsmalını mən yudum
Sərdim bulaq başında.

– Hicran çırağı sönsün
Kaş elçilər görünsün.
– Barı sevincə dönsün
Dərdim bulaq başında.

*20 may 2001*

## YIXILA-YIXILA

Sevinclə ucalan,
Dərdlə əzilən,
İnsan Allah deyə
Arzuya yetsin.
Yıxıla-yıxıla
Dünyaya gələn,
Yıxıla-yıxıla
Dünyadan getsin?

Ağrılar üstündən
Gəlir ağrılar,
Ayaqlar dünən dost –
Bu gün yağılar.

Vallah lap ölümə
Mən hazıramsa,
Şeirdən ayrıla
Bilmirəm ki, mən.
Yıxıla-yıxıla
Mən yazıramsa,
Yaxıla-yaxıla
Oxuyur düşmən.

Sızlayır bədəndə
Dərin yaralar.
Ayaq ağrıları
Hər dərddən müdhiş.
Yıxıla-yıxıla
Gələn misralar
Paxıla sovqatdır,
Yaltağa bəxşiş!

Doğma ayaqlarım
Mənə gərəkdir,
Əzim yollardakı
Daşı, kəsəyi.

Əsa kimə arxa,
Kimə bəzəkdir.
Əsla istəmirəm
Əsa bəzəyi.

Arzum nədir? Keçim
Düzdən, dərədən,
Görüm ağ çalmalı
Şiş dağlarımı!
Allah, şikəst ömür
Diləmirəm mən,
Allah, qaytar mənə
Ayaqlarımı.

*1 avqust 2004*

## PƏRİŞAN

Gecə… Mən vurğunam
Göylər sirrinə.
Ulduzlar göz vurur
Biri-birinə,
Ulduzlar pərişan,
Gözlər pərişan.

Gecə. Ay nəğməsi
Sakit, mənalı,
Ay özü göylərin
Bəyaz bir xalı,
Şəfəqlər pərişan,
Səslər pərişan.

Gecə zühur edir
Gözəl mələklər
Tellər parıldayan
Zər kəpənəklər,
Tellər pərişandır,
Üzlər pərişan.

Gecə. Xatırladım
Sevdiyim yarı,
Yazdım asta-asta
Mən misraları,
Misralar pərişan,
Sözlər pərişan.

Səhər… Çıxdı Günəş
Şəfəqlər axdı
Demə, pərişanlıq
Cahanda yoxdur
Ürək pərişandır,
Hisslər pərişan.

*2 avqust 2004*

## BUNA NƏ DEYİM?

Göyün, yerin cazibəsi,
Ürəklərin cazibəsi,
Buna nə deyim?

İki qəlbin məhəbbəti,
Sevginin and sədaqəti,
Buna nə deyim?

Yarla acı danışasan,
Sonra gülüb barışasan,
Buna nə deyim?

Söz yarası dərin olur,
Mehriban söz şirin olur,
Buna nə deyim?

Bir ömürlük yolu getmək,
Can deyərək can eşitmək,
Buna nə deyim?

Ömür dostum, xəyal olsan,
Səadəti məndən alsan,
Buna nə deyim?

İşıq yansın qaranlıqda,
Qoysan məni tənhalıqda,
Buna nə deyim?

Göylərdən dərd, kədər gəlir
Təklik dərdə bərabər gəlir,
Buna nə deyim?

*21 yanvar 1988.*

## MÜRACİƏT

Allahım, lütf elə
De, bu nə işdir?
Müqəddəs məhəbbət
Hara getmişdir?
Kim deyər Məcnun var
Yoxsa Leyli var,
Onlarla yox olub
İnam, etibar?

Məcnun köhnəlikdir,
Leyli köhnəlik.
İndi "sevgi" olub
Bircə gecəlik.
Fəqət cavanların
Dilinə gəlmir:
"İnsan köhnəlsə də,
Sevgi köhnəlmir!"

Axşam əlvan-əlvan
Paltar geyinən,
Qızlar "tanış" evə
Gedir bir dəstə
Gündə neçəsinə
"Sevirəm" deyən,
Neçə dollar öpüb
Qoyur göz üstə.

Bu Məcnun görəsən
Necə insandır.
Ürəkdən gülüşür
Təzə Leylilər.
Cibi boş, rütbəsiz,
Üst-başı cındır
Müasir Leylilər
Onu neyliyər?

Nə deyəsən belə
Yoluq insana
Hələ opera da
Yazıblar ona.

Allahım, lütf elə
Səcdə qılmağa,
Qadir məhəbbəti
Qaytar insana.
Ürək istəyini
İncə çalmağa,
Əzəldən bəzəkdir
Sevgi cahana.

Gözlərdən yaşları
Biz silə-silə
Qayıdaq sevgiyə,
Allah, lütf elə!

*26 iyul 2004*

## SƏN GƏLƏN ZAMAN

Əsdikcə bağçamda
Sərin bir külək,
Qızılgül parlayar,
Kollarda tək-tək.
Uca ağaclarım
Səcdə edəcək
Sən gələn zaman.

Bir boy uzanacaq
Heyva ağacı.
Ağ-yaşıl yarpaqdır
Başının tacı.
Yollara baxmaqdır
Onun əlacı
Sən gələn zaman.

Meynələr qol atıb
Torpaqlar üstdən
Quşlar haray salıb
Orda həvəsdən.
Qorxma civiltili
Hay-küylü səsdən
Sən gələn zaman.

Nurlu – günəbaxan –
Bağçaya bəzək.
Əncir ağacı da
Küləkdən kömək.
Əncir hələ kaldır –
Bəlkə dəyəcək,
Sən gələn zaman.

Narın da qızıldan
Ulduzları var.

Əfsus, seyrək-seyrək
Bu il barı var.
Qopar qəlbim kimi,
Dəymiş narı var
Sən gələn zaman.

Salamla baş əyən
Günəbaxan görərsən,
Günəşdən üz döndərib
Sənə baxan görərsən.
Arxaya çevrilsən də
Sənə baxan
Günəbaxan görərsən,
Sən gələn zaman.

*25 iyul 2004*

## QIZIL YELKƏN

Zülmət üfüqlərdə solğun bir işıq,
Təbiət göylərə ulduzlar düzür.
Dünən Ay bütövdü,
Bu gün yarımçıq.
Sanki qızıl yelkən çəpəki üzür.

Ulduzlar parlayıb düşür qayığa
İstəyir yelkənlə sahilə çıxa.
Yelkən qucaqlaşır karvan yoluyla
Yol alıb gedir.
Sanki qol-boyundur çıraqban Ayla,
Göylərə qızıldan iz salıb gedir.
Elə bil İlahi bir əfsanədir.

Səhər… Günəş doğdu, rənglər itdilər
Göylər mavi-mavi, sönüb ulduzlar.
Ulduzlar yelkənlə hara getdilər?
İlahi, aç mənə bunda nə sirr var?
Bir qızıl qayığa möcüzə kimi,
Min-milyon ulduzlar sığa bilərmi?

*8 sentyabr 2003*

## TOYQABAĞI DÜŞÜNCƏLƏR

Sevginin əlində
Zərif oxu var,
Tuşlayır ürəklər
Qovuşsun – deyə.
Qəlblərin arzusu
İnam, etibar,
Sevənlər mələk tək
Ucalsın göyə.

Bir könül tənhadır
İki qəlb xoşbaxt.
Onlarçın yol açır
Zaman ilə vaxt.

Onlar mələklərin
Qanadlarında,
Sirrini öyrənir
Göy və yerin də.
Nəsil də gözləyir
Öz adlarında.
İnamı bəsləyir
Ürəklərində.

Nişan da taxılır
Nişanə üçün,
Toy-zifaf gecəsi
Qoşa bir ömrün.
Nişan doğmalığın
İlk addımıdır,
Yeni bir dünyaya
Qədəmlər atır.

Əsl şadyanalıq
Məhəbbət eylər,
Kim bunu unutsa
Qəbahət eylər.

Ürəklər qoy sevsin
Bir ömür qədər.
Əllərə əbədi
Qovuşsun əllər.
Birləşsin insanın
Nəcib əməli.
Allah doğma etsin
İki taleyi!
Olsun ailənin
Möhkəm təməli
Polad mətinliyi
Qız zərifliyi.

*7 avqust 2004*

## DƏRMAN VƏ FƏRMAN

Görən necə dözür
Buna bədənim?
Günlərim ah ilə
Amana dönür.
Bədənimin çoxu
Dərmandır mənim
Maaşın hamısı
Dərmana dönür.

Həkim: – Laxtalanıb,
Təmizlə qanı.
Bal kimi içirəm
Acı dərmanı.

İçirəm nə olsun?
Ürək ağrıyır,
Ayaqlar ağrıyır
Böyrək ağrıyır.

Vaxt vardı çağlayan
Ümmandım, çaydım.
Çıxdığım dağlara
Bir də çıxaydım.

Köçən tək sahildə
Sevimli bağa,
Obaşdan qaçardım
Balıq tutmağa.

İndi heç bilmirəm
Nədəndir bu sirr,
Övladlar Nabranı
Daha çox sevir.

Atamız tənhadır,
Qoy tənha qalsın.
Ümidi tək bircə
Allaha qalsın.

Nə pulu vardısa
Tamam soymuşuq,
Ata sevgisindən
Daha doymuşuq.

Nolsun, bir gün toxdur
Bir gün də acdır
Əlacsız xəstəyə
Aclıq əlacdır.

Çox ölkələr gəzdim
Dərd çəkə-çəkə.
Allahın adıyla
Yaşadım, bəlkə.

Həkimə inam yox,
Dərmana inam.
Yox ömür yoldaşım,
Yox doğma anam.
Halallaşıb sabah
Yola düşərdim.
Əbədi dünyaya
Rahat köçərdim!

Nə suyum, çörəyim,
Dərmanım olsun.
Tək alın yazısı
Fərmanım olsun.

*10 avqust 2004*

## AY QƏLƏMİM!

– Niyə susdun ay qələmim,
Mən susuram, sən susursan.
– Gəlir dərdin, gəlir qəmin
Sən yazmağı unudursan.
– Şair, sirri özündə gör,
Alov yoxsa, necə yanam?
– Susmağı da sözündə gör,
Mən ki sənə tərcümanam.
– Ləngəri var ağ yelkənin
Qarşısında tufan çoxmu?
– Ağır keçir günün sənin
Sahil üçün güman yoxmu?
– Arzum ömrün sahilidir,
Yazmaq üçün qəlbim, əmin.
– Axı yazmaq təsəllidir,
Yorulmasın qoy qələmin!
– Göylər parlar çilçıraqla
Yansın qəlbdə ulduz-çıraq.
– Sən ilhama könül bağla
Onda ömür uzanacaq.

*30 iyun 2004*

## GÜNƏŞ MƏNƏ NƏ DEDİ?

Nə qədər dünyalar
Çıxır qarşıma,
Uca cahanıyam
Cahanların mən.
Yer kürəsi dönür
Mənim başıma,
Başına dönürəm
İnsanların mən.

Dünya şəbnəmini
Erkən silirəm,
Mənim məskənimdir
Ən uca qatda.
Deyirlər dağları
Aşıb gəlirəm
Yox, aşan dağlardır
Şəfəqim altda.

Sevirəm səsini
Gülüşənlərin,
Mən öz qüdrətimi
Yerdən alıram.
Yayın istisində
Görüşənlərin
Üstünə buluddan
Kölgə salıram.

Gündüz işıq olur,
Gecəsə qara,
İnsan arzuları
Ancaq nurludur.
Bəhər mən verirəm
Əgər bağlara,
Əkib becərənsə
İnsan oğludur.

Haqqı, ədaləti
Yaxşı mənəmsə,
Hərcayi hisslərə
Uyma, amandır!
Səmanın Günəşi
Əgər mənəmsə,
Yerinsə Günəşi
Ancaq insandır.

*22 iyun 2004*

## ANA XALISI

Heykəldir o ömrün
Boz sahilində,
İllərin zəhməti,
Böyük hünərdi.
Rəngbərəng naxışlar
Ana əlində
Arfa telləri tək
Nalə çəkərdi.

Bizi çulğamışdı
Kasıblıq, azar.
Amma ki, sənətin
Görünür yeri.
Dəyər-dəyməzinə
Gedən xalılar
Görəsən bəzəyir
Hansı evləri?

Atam mən uşaqkən
Köçdü dünyadan.
Ana qayğıları
Birə min oldu.
Qəmli bir kəcavə
Apardı zaman,
Anam cavan vaxtı
Saraldı, soldu.

Ağrılar ürəkdə,
Kədər üzündə.
Beli əyilmişdi
Xana üstündə.

Dilində dualar,
Qəlbində inam.
Dağı əridərdi
Könlünün dərdi.

Özü yazı yazmaq
Bilməyən anam
Xalıya ən müdrik
Söz köçürərdi.

Gəldi taleyinə
Acı bir təlaş,
Fəlakət qapını
Çox erkən döydü.
Dörd oğul itirib
Bircə də qardaş,
Ana sənətilə
Üç qız böyüdü.

Anam çəmənlərə
Erkən çıxardı.
İplərə boyaqçın
Güllər yığardı.

Alnından astaca
Təri silərdi,
Onunla düzlərin
Ətri gələrdi.

Boymadərən, sarı çiçək
Dəstə-dəstə ləçək-ləçək.
Bağda bitib nar ağacı,
Budaqlarda ulduz tacı.

Naxışlar dönərdi
Asimanlara
Asiman dönərdi
Kəhkəşanlara.
İlmələrdə qopan
Ulduz tufanı,
Nura boyayardı
Bütün dünyanı.

Mən necə ayrılım
Qəm illərindən.
Düzlərə çıxıram
Mən səhər-səhər,
Özü çoxdan köçüb
Yer üzərindən,
Ana xalısıdır
Çöllər, çəmənlər.

*20-21 iyun 2004*

## ŞAİR KİMDİR?

Şeri mən yazmıram,
Özü yazılır
Ürəyin dediyi
Sözü yazılır.

Sevgi misraları
Düzüm-düzümdür
Sinədə titrəşən
Sirli sözümdür.

Məhəbbət ordadır,
Nifrət də orda
Mən ona dözürəm
Soyuqda, qarda.

Ağrını, acını
Qəlbimdir görən
Sözlər axınladır,
Mənəm köçürən.

Fikirlər layiqcə
Söz mübarəkdir.
Şair mən deyiləm,
Şair ürəkdir!

Uzanır ömrümdən
Sehirli bir yol,
Sənə minnətdaram,
Ürəyim, var ol!

Ey qələm sahibi,
Yaxşıca bil sən,
Ürəksiz yazdınmı,
Şair deyilsən!

*21 iyul 2004*

## DAN YERİ QIZARANDA

Boylanır üfüqün
Yanar atəşi
Təbiət salama
Durur günəşi
Dan yeri qızaranda.

Dağlar da görünür
Dağlardan yüksək,
Qızıldan tökülmüş
Abidələr tək,
Dan yeri qızaranda.

Şəlalələr uçan
Büllura dönür
Çaylarsa çağlayan
Zər nura dönür.
Dan yeri qızaranda.

Durna qatarları
Yaza xoş gəlir
Durna yox elə bil
Qızılquş gəlir,
Dan yeri qızaranda.

İnsan oğlu erkən
Çatır zəmiyə
Öz halal ruzumu
Tez yığım – deyə
Dan yeri qızaranda.

Yatır nurlu yerə
Bu parlaq səhər
Zərli bir dəryazdan
Qızıl sünbüllər
Dan yeri qızaranda.

Tərini silərək
Oturur insan,
Sonra da göylərə
Üz tutur insan,
Dan yeri qızaranda.

Deyəsən olacaq
Ruzum bol Günəş!
Şükür Allaha!
Sən də ki, var ol Günəş,
Dan yeri qızaranda.

*17 iyul 2004*

## HARAY

Öz nəslini dahi sayıb
Dahi olandan, haray!
Mərtəbəsiz mərtəbədən
Haray salandan haray!
Yaltağın özü yaltağa
Yaltaq deyəndən haray!
Uca-uca rütbələrə
Boyun əyəndən haray!
Oğru gəldi mən qaçdım –
Haray – səsindən haray!
Cibindəki oğurluq
Pul kisəsindən haray!
Rüşvətxor dedi ki, rüşvət
Yamanca artdı, haray!
Özü alan rüşvətsə
İndi ikicə qatdı, haray!
Şəxsin on-on tikdirdiyi
Zərli saraydan, haray!
Gur haray bağıranlardan
Coşan haraydan haray!
Nəbi, sənin ürəyindən
Axıb gəldi bu haray!
Bəlkə…Bəlkə…
Haradasa eşidildi bu haray!

*19 iyul 2004*

## ÖZÜM ÜÇÜN AĞI

O qədər əzaba
Sinə gərmişəm.
Yaxşılıq eyləyib
Pislik görmüşəm.

Boyun əyməmişəm
Kimsə önündə,
Gah coşub, gah susub
Gah çağlamışam.
Heç kim ağlamasın
Vida günündə
Mən özüm özümçün
Çox ağlamışam.

Əzablı ömrümün
Qışı, qarı var.
Heç kimdən etmədim
Dünyada giley,
O qədər yubiley
Həvəskarı var
Dedim istəyənə
Qalsın yubiley.

Ürəkdə zülmətdir
Göydə çıraqban,
Mənim doğma kəndim
Qanım, canımdır.
Çatsın layiqlərə
Fəxri xiyaban,
Mənim xiyabanım
Xırdalanımdır.

Atamın yanında
Basdırın məni
Daşıma "şairdir"
Yazdırın mənim.

Atamı doyunca
Görmədim axı,
Üfüq kölgəliydi,
Gecələr qara.
İtirdim mən onu
Lap uşaq çağı.
Mən karvan yoluyla
Uçaram ora.

Nəfəsi üzümdə,
Adı dilimdə,
Bəlkə onda bitər
Yetimliyim də.

Qoşa Ələkbərlə
Sadiq yarıma
Həsrətlilər kimi
Mən rast gələrəm.
Müqəddəs Allahdan
Balalarıma,
Ömür arzulayıb
Sağlıq dilərəm.

Qəlbimdə dərdləri
Bitər aləmin …
Amin!!!

*5 iyul 2004*

## TƏNHA DURNA

Qatarın tələsdi,
Sənmi ayrıldın?
Bəlkə də yorulub
Yollarda qaldın?
Kimi axtarırsan
İndi, a durnam,
– Sanki bir ah çəkdi
Sehirli dünyam.

İpək qanadını
Açıb gedirsən,
Söylə, hara belə
Uçub gedirsən?
Sənin harda qaldı
Baharın, yazın?
Durna da dünyada
Tənha olmasın!

Birdən göyə qalxdı,
Yerə şığıdı,
Sanki üfüqlərdə
Bəyaz nurdu o,
Nidası mahnıydı,
Yoxsa ağıydı?
İlkin nəğməsini
Oxuyurdu o.
Beləcə ah çəkib
Son nəfəsiylə –
Əsrə vida dedi
İlk nəğməsilə.

*27 iyul – 23 avqust 2003*

## AĞILLI GƏMİ

Səma mənim, dünya mənim,
Dünya boyda dərya mənim!
Tüğyan etmə bu qədər sən,
Zərif mehdən titrəyərsən.

Mən dəryada doğulmuşam.
Dalğalarla bir olmuşam.
Oynadacaq səni külək,
Ağ köpüyə çevirəcək.

Qəzəbli fırtına
Tutub aləmi.
Dalğadan dalğaya
Adlayır gəmi.
Sükançının mətin səsi
Xoş nəğmə kimi!

Dəli fırtınanı
Susdurur sözü,
Mehriban səsi,
Bir də gəmisi.

Ağappaq köpüklər
Halqa halqadır.
İndi gəmi özü
Bəyaz dalğadır.
Balıqlar oynaşır,
Rəngbərəng, xallı…
Fırtına güclüdür,
İnsan ağıllı?

*15 iyul 2003*

## GƏLDİN SƏN

*Oğlum Hacı Arzunun qızı Gülarə üçün*

İllər boyu biz gözlədik
gəldin sən
Bir dünyalıq səadətlə
güldün sən
Atan sənə anasıtək
ad verdi,
Anan sənə ürəyindən
od verdi.
Atan sanki yetimlikdən
qurtardı,
Göydə durna çarpaq qatar-qatardı.
Bəlkə elə durnalarla
gəlmisən,
Onunçun da saçı ipək
kimisən.
Böyü ata, analı sən,
əzizim,
Doğmaların doğmasısan
sən bizim.
Əgər adı qoyulana
bənzəsən
Dünya sevinc verəcəksən
bizə sən.
İndi onun məhəbbəti
səndədir.
Sədaqəti, mərhəməti
səndədir.
Qoy səcdənə əyiləm mən
dünyada,
İndi tənha deyiləm mən
dünyada!

*12 noyabr 2003*

## TƏNHALIĞIN ELEGİYASI

Fikir ağır…
düşünürəm bir anlıq,
bəlkə mənim
yaşamağım hədərdir.
Gecələrim
gecələrdən qaranlıq,
Gündüzlərim
gecələrdən betərdir.
Yuxularım
yuxu deyil, qorxudur.
Dərman üstdən
dərman içim, xeyri yox,
Ahlarımı
göylər udur, yer udur,
Nədəndirsə,
ilham küsüb, şeri yox.

Yaxşılara
mehribanam əzəldən,
Yaltaqlara,
paxıllara nifrətəm,
Dostlar uçub
hara gedib görəsən
Gülər üzə,
şirin sözə həsrətəm
Yer qovuşub,
göy qovuşub sükuta,
Tənhalıq da
asta-asta adlayır.
Ürək batır
qara-qara buluda,
Kimsəsizlik
şimşək olub odlayır.
Nədir gəlib
çarpayıma qonan nur

Bir İlahi
şəfəq saçır otağa.
De, bu anda
qəlbim ondan nə umur?
Ulduz gəlib
tənhalığı qovmağa?
Ulduz yandı,
sakit otaq nurlandı
Bir ulduz da
insan üçün hayandır!

*25-26 oktyabr 2003*

## HƏSRƏT

Xəstəyəm.
Qalmışam dağlara həsrət,
Uca zirvədəki
Ağ qara həsrət.
Ulduzam.
Baxıram mən aya həsrət,
Qurumuş vadiyəm,
Gur çaya həsrət.

Eyvandan günlərlə
Baxan qız hanı?
Mənə həsrətliyə
Mən özüm həsrət.
Onu axtarıram
Gəzib dünyanı,
Əfsus ki, gecikmiş
Son sözüm – həsrət!

Zaman axıb getdi,
O, harda qaldı?
O, bir həqiqətdi,
Yoxsa xəyaldı?

Dərddir öz əlinlə
Pozulan həsrət,
İllər əqrəbindən
Asılan həsrət!

Nə böyük bəlamış
Bildim cahanda,
Həsrətin özüyçün
Həsrət qalanda!

*18 fevral 2004*

## MƏNİM KƏNDİM – ZİYARƏTGAHIM

Mənim ana kəndim –
Ziyarətgahım!
Haçandır səninçin
Qəribsəmişdim.
Bəlkə elə buymuş
Mənim günahım?
Onunçun yıxılıb
Zəifləmişdim?

Əsayla astaca
Həyətə gəldim,
Yazın gül ətrindən
Heyrətə gəldim!

Ağaclar ucalıb
Heykəllər kimi:
– Bizə sən su verdin
Ana, ay ana!
– Müqəddəs, ətirli
Gözəllər kimi
Göyə qalxırsınız
Ana yanına?

– Sənin gözəl-göyçək
Oğul, qızın var.
Onlar az-az dəyir
Gözlərimizə.

– Bu gün meynələrdə
Gümüş, qızıl var.
Burda yerlər təzə,
Göylər də təzə.

Eybi yox, qanadım
Qızım, oğlumdur.

Onların taleyi
Tale yolumdur.
Kimə Nabran gözəl,
Kimə Xırdalan.

– Sənin Nigar adlı
Əziz nəvən var!
– Kəndə gedəcəyik
Ana, bəs haçan?
Kəndi istəyirəm,
Şəhərdə nə var?

Gün doğur göylərin
Üfüqlərində,
Bağda cəh-cəh vurur,
Quşlar səs-səsə.

– Onun əsasını
Mən gəzdirərəm.
Fəqət anam yoxdur
Yer üzərində.

Birdən saçlarımda
İsti əl gəzdi.
Anam hara getdi,
Hara tələsdi?

Yamyaşıl ümmanda
Qaldım yenə tək.
Dolandı dövrəmdə
Yaşıl kəpənək…

*12 iyun 2003*

# MƏNİM CƏNNƏT SAKİNLƏRİM

## 1. OĞLUM ƏLƏKBƏR

Allaha min kərə
Elə yalvardım,
Sənin görüşünə
Gəlmək üçün mən.
Bir dəfə axirət
Gününə vardım,
Dirildim son dəfə
Ölmək üçün mən.

Nənən də ordadır,
Baban da orda,
Ananla birgəsən –
Bu səadətdir.
Gözümə görünmür
Qış da, bahar da,
Tənhalıq ən böyük
Bir fəlakətdir.

Ayrılıq yaşında
Qalıbdır yaşın,
Biz ömür sürmüşük
Necə dövrandır.
Xanım, Gülüş bacın,
Arzu qardaşın
Şükür ki, Allahdan
Pak ərməğandır.

Sən mənim dördillik
Qonağım oldun,
Gec gəlib tez gedən
Sehirsən, sirsən,
Məni gözləməkdən
Bəlkə yoruldun?
Cənnət qapısında
Keşik çəkirsən.

Baxışında kədər,
Gözlərində nəm,
Deyirsən: atamı
Haçan görərəm?

Sən «ata» çağırıb
Köçdün dünyadan,
Gecikdi görüşə
Vəfasız atan!

Çalıram qırılmış
Simsiz tarımı,
Haçan bir bulaqdan
Su içərik biz?
Tanrım bağışlasa
Günahlarımı
Tezliklə cənnətdə
Görüşərik biz.

Heç fikir eyləmə
Az qalıb daha,
Şükürlər deyərəm
O gün Allaha!

## 2. ANAM PƏRİ XANIM

Gətirdin dünyaya
Sən neçin məni?
Qara tellərini
Erkən ağ hördün.
Doğdunmu əzablar
Çəkməkçin məni
Özün məndən böyük
Əzablar gördün!
Beş oğul gətirdin
Cahana, anam,

Təkcə sonbeşiklə
Qaldın bərabər.
Üz tutdun Allaha
Qəlbində inam:
Mini bir eyləyən,
Biri min eylər!

İnsan zəhər uddu,
Qəmlər yedi də,
Mərd atam Ələkbər
Köçdü dünyadan.
Dayım Qəzənfər də
Otuz yeddidə
Köksündə güllələr
Köçdü dünyadan.

Bir nəvən doğuldu –
Atam adında,
Sevincdən sığmadım
Dörd il cahana.
Fəqət, uçdu nəvən
Quş qanadında
Bu gün yanındadır
Cənnətdə, ana!

Yanına gəldi ki,
Sonra gəlinin,
Azalsın kədərin,
Azalsın qəmin.

İnsan girovudur
Qara günahın,
Tale saxlamasın
Kölgədə məni.
Ulu mərhəməti –
Qadir Allahın
Sizə tez çatdırdı
Bəlkə də məni.

## 3. ÖMÜR YOLDAŞIM GÜLARƏ

Çəkdim yer üzünün
Əzabını mən
Qara rəngdə gördüm
Sabahlarımı.
Yazdım «Qəm dəftəri»
Kitabını mən,
Dedim: Bəlkə yudum
Günahlarımı.

Könüldə atəş var,
Ürəkdə ah var,
Onların önündə
Səcdəyə əyil!
Fəqət sonra bildim
Elə günah var,
Su ilə, tövbəylə
Yuyulan deyil!

– Ay Nəbi, sözümü
Sənə deyirəm,
Yox Ələkbər nuru,
Lalə çırağı!
Mən məgər xəstəyəm?
Mən dərd çəkirəm:
Çox erkən itirdim
İki uşağı.
– Yox, sənin həyatda
Bir nəslin vardır,
Dünyaya övladlar
Gətirmisən sən.
Hərəsi bir uca
Məğrur çinardır
Onları igid tək
Yetirmisən sən.

Sözü Ələkbərin
Orda bal dadır,
Lalə qızcığaz da
Qucağındadır.

Arzum var,
Günahlar
Bağışlanarsa,
Cənnət kölgəsindən
Qoşa keçərik.
Uludur insanın
İnamı varsa:
Biz kövsər suyundan
Birgə içərik.

## 4. ATAM KƏBLEYİ ƏLƏKBƏR

Anam danışırdı
Uzaq keçmişdən!
– Atan Kərbəlaya
Piyada gedib.
Doyunca o, səni heç görməmişdən
Sanıb ki, əbədi həyata gedib.

Atam adlarayaq
Dərə, təpə, düz,
Altı ay yol keçib gecəbəgündüz.
Dövran verdi mənə
Qartal qanadı,
Atam çağırırdı
Haraya çatdım.
Doğma Ələkbərin yetim övladı
Mən üççə saata oraya çatdım.

Başımız üstünə
Od töküb zaman,

Anamda ata tək
Qüdrət və mərdlik.
Atam mən uşaqkən
Köçüb dünyadan
Düşünüb haçansa
Görüşəcəyik.

Axdı gözlərimdən
Yaş gilə-gilə,
Dedim ki, nə əziz
Yerdə görüşdük.
Gümüş barmaqlıqlar
Hərarətilə
Elə bir son qoyub dərdə, öpüşdük.

Nurani bir qoca
Yanaşdı mənə,
Elə bil burdaydı Xırdalan kəndi.
Məni həsrət ilə basdı köksünə
Bəyaz saqqalında yaş giləlendi,
Gözümdə al-qızıl lalələr bitdi,
Tanrı bu xəyaldı, ya həqiqətdi?

Bir ata ömrünü
Uzadım deyə,
İki ata ömrü yaşamışam mən.
Sənətdə öz sözüm, öz adım deyə,
Əsrin dərd yükünü daşımışam mən.

Erkən başı üstdə
Şimşək çaxsa da,
Qeyrəti illərdən illərə çatdı.
Onu çinar kimi tufan yıxsa da
Təzədən göyərib qol-budaq atdı.
Yaşamadım ancaq yaşamaq üçün,
Yaşadım atama oxşamaq üçün.

## SORUŞMA

İnsaf oldu, –
Din saf oldu.
Görüş gözləyirsən
Ayrılıq gəlir,
Ürək həzin-həzin
Dinir, soruşma!

Günəş dünyalara
Nur səpələyir
Niyə dağ dalında
Sönür, soruşma!

Neçin sevənlər də
Sevməyənlər də,
Eşq üçün səcdəyə
Enir, soruşma!

Qəlbdə acı kədər
Nədir, soruşma?
Ömür asta-asta
Gedir, soruşma!

Kimin mələk ruhu
Uçur göylərə,
Kimsə daş altına
Enir, soruşma!

Torpaqda sal buza
Dönür, soruşma!
Belədir dünyada
Ömür, soruşma!

## SİZƏ SALAM OLSUN,
## MƏNƏ ƏLVİDA!

Mənim əcəl adlı
Bir gözləməm var.
Bəlkə ondan sonra
Sirli aləm var.
O aləm nədir?
O ancaq Allahın
Öz əmrindədir.

Ürəyim sızlayır
Ürəklər üçün,
Ürək boş yuvadır
Diləklər üçün.

Bəs nəyi anırsan,
Satqın dostları?
Qoltuğa sığınan
İtirər arı!

Ona çatmasa da
Millətin əli,
Amma ki, çağrılır
Millət vəkili!

Mən yerə, mən göyə
Dedim misralar.
Bu gün yatır qəlbdə
Yetim misralar.

Nə qədər ömrümə
Gəlib qan-qada,
Dərdi edam üçün
Dardan asmışam.

Sanardım yazaram
O dünyada da.

Fəqət bu dünyada
Artıq susmuşam.

Bildim ki, həyatda
Susan bir ürək,
Artıq o dünyada
Heç dinməyəcək.

Yazmaq da, pozmaq da
Demək hədərmiş,
Ürək, sənin vəfan
Bura qədərmiş?

Dostlara qoy yaxın
Gəlməsin ölüm,
Qarıyıb, qocalıb
Tarix olsunlar.

Sevincim yoxdur ki,
Dostlarla bölüm
Barı dərdlərimə
Şərik olsunlar.

Qaçmaz qanunundan
Kimsə həyatın,
Dayazda üzmədim,
Dərində batdım.

Kaş ömrün sonuna
Siz çox gec çatın,
Keçdim addım-addım,
Mən axır çatdım!

Həyatın zəngindən
Gəlir son səda,
Sizə salam olsun,
Mənə əlvida!

*9 yanvar 2003*

## QARDAŞIMIN TARI

Necə də tufanlı,
Dərdli zamandı,
Necə də bənzərdi
İllər illərə.
Deyirlər mehriban,
Zərif cavandı,
O, mizrab vurardı,
Zərif tellərə.

İyirmi iki yaşlı
Müəllim, tarzən
Öz xəstəliyini
Bilirdi erkən.
Zəif ürəyinə
Təskinlik üçün
Tellər sızlayardı
Kədərli, küskün.

Dörd qardaş dünyadan
Köç etdi getdi,
Bütün ailəyçin
Bu müsibətdi.
Dərdini hamıdan
Gizlərdi qardaş,
Fəqət öz vaxtını
Gözlərdi qardaş.
Yetmiş ilə çatır
Tanılmır o tar,
Kimdədir, hardadır
O tar, yadigar.

Ya Rəb, tapılaydı
Əziz ərməğan,
Asardım evimin
Baş divarından.
Sanardım qardaşım

İndi gələcək,
Sirli bir mənada
Tar dillənəcək.
Tellərdən sızacaq
Faciə və qəm,
Uzaq qardaşımı
Eşidəcəyəm.

Ölüm nə tez gəldi
Söylə, a Tanrı,
Susdurdu qardaşı,
Susdurdu tarı.
Hələ yer üzündə
Kam almamışdı,
Sevgi nəğməsini
O çalmamışdı!
Ah, necə vəfasız
Olurmuş həyat?
Onun sarı simi
Qırıldı heyhat!

O, gəlir gecələr
Yuxularıma,
Tellər də çəkilir
Onda tarıma,
Sehirli səs düşür
Yerə, havaya.
Sarı sim bir tufan
Salır dünyaya.

Bəlkə ürəyimə
Təskinlik üçün,
Mehriban danışır
Sarı sim bu gün.
Dinir ilk yalandan,
Son həqiqətdən,
Sarı sim hay verir
Əbədiyyətdən…

*12 iyul 2004*

## GÜNƏBAXAN

*Bacım oğlu İsmayıla*

Günəş üfüqlərdən
Boylanan kimi
Günəbaxanlara
Salamlar deyir.
Günəbaxanlar da
Oyanan kimi
Dillənir: – Ay ana
Sabahın xeyir!
– Bir gecə ayrıldıq,
Darıxmısınız?
– Sənsiz baş əyirik
Biz yerə yalnız.
– Mənim zərrələrim
Sizsiniz axı,
Siz öz nurunuzla
Öpün torpağı.
– Yerdə insanlar var
Gecə də oyaq,
Əkib sulayırlar
Bizi, solmayaq.
– İnsan eşqi yerə,
Göyə də çatır,
Hər insan qəlbində
Bir günəş yatır.

Günəbaxanlara
Baxan insanlar.
Dünyada ən böyük
Savab qazanar.
İki Günəş üz-üzə,
Bəzək verər gündüzə.

Mərd insan müqəddəs
Zəhmət çəkəndir,
Günəbaxan əkən
Günəş əkəndir.

*11 iyul 2004-cü il*

# GÖZƏLLİK ALINIB SATILAN ZAMAN

Sevgilər itirib
Zərurətini,
İçilən andlar da
Həqiqət deyil!
Müəllim tələbə
Bəkarətini
Dollara alırsa
Fəlakət deyil?

Kimsə güdür ciblər
Səxavətini,
Onu düşündürən
Məhəbbət deyil!
Nazir katibənin
Od şəhvətini,
Zorla söndürürsə
Cəsarət deyil!

Dubaya satılan
Nadir gözəllər,
Məgər ki, dünyada
Rəzalət deyil!
Zərif bədənləri
Didən cod əllər
Tanrı qarşısında
Cinayət deyil?

Çirkin girdablarda
Boğulur insan,
Onun köməyinə
Sən yetmə, Allah!
Sevgilər alınıb
Satılan zaman,
Belə günahları
Əfv etmə, Allah!

*29 iyun 2004*

## YUXULARDAN YUXULARA

Nə zaman görmüşəm,
Səni nə zaman?
Hər an sığınmışam
Etibarıma.
Sən hələ dünyaya
Göz açmamışdan
Gəlirdin astaca
Yuxularıma.

Cahan gur işıqla
Elə doldu ki,
Qoşdum zirvələrdən
Mən düzə kimi.
Özüm də bilmirəm
Necə oldu ki,
Birdən gördüm səni
Möcüzə kimi.

Kədərlə qarışıq
Sevinc duydum mən,
Baxanlarsa, məni
Bəxtəvər sayır.
Eyni bir taleli
İnsanlar görən,
Nə üçün dünyada
Ayrı yaşayır?

Başqa bir ümid də
Oyanır məndə,
Sən də sığınarsan
Etibarına.
Bəlkə mən dünyadan
Köçüb gedəndə,
Gələrəm astaca
Yuxularına!

*30 yanvar 2002*

## FÜZULİ İLƏ SÖHBƏT

Tənha oturmuşam nə vaxtdan bəri,
Elə bil sönmüşdür ilhamın odu.
Təkcə ürəyimin döyüntüləri,
Yenə aram-aram pozur sükutu.

Yol alıb sinəmdən min bir söz keçir,
Fəqət o ustada layiq görmürəm.
Gözümdən yamyaşıl dərə, düz keçir,
Niyə çiçək dərib çələng hörmürəm?

Dinlədim quşların təranəsini,
Sanki birdən-birə sərin meh əsdi.
Eşitdim kiminsə ayaq səsini,
Sanki doğma bir əl saçımda gəzdi.

Mehriban baxışlar bulaqtək duru,
O çal qaşlar isə qartal qanadı.
Nurani üzündə hikmətin nuru,
Tanıdım, tanıdım böyük ustadı.

O dindi: "Görürəm, haçandır ki, sən
Kağızlar içində qurdalanırsan.
O nədir, şeirdir yazdığın deyən,
Sən də şairmisən, ay cavan oğlan?"

Baxdı lap gözümün içinə şair,
Dilləndim astaca, ürəyimdə qəm:
– Şair deyəndə ki, axı nə şair,
Min şeir yazanın biri də mənəm.

– Bəli, mən bilirəm şairlik nədir,
Kimi doğru yazır, kimisə yalan.
Son sözü xalq deyir, zaman söyləyir,
Şair ki, olmayır hər şeir yazan.

Kim ki, öz elinin dərdini bildi,
El onun ömrünü uzadacaqdır.
Kim ki, öz elilə ağladı, güldü,
El onu qəlbində yaşadacaqdır.

Könlüm bu torpaqdan ayrı deyildir,
Şairin ürəyi ilhamsız olmaz...
Şeir deməmişəm mən dörd yüz ildir,
Ürəyim doludur, deyim, sən də yaz.

Məndən uzaq oldu doğma Vətənim,
Daşını ləl bildim, torpağını dürr.
Demə, misralarım sızlayır mənim,
Ürək gülməyəndə şeir də gülmür.

O dedi, danışdı, çatıldı qaşlar...
O dedi, o baxdı, mən isə yazdım...
O dedi, əridi zirvələrdə qar...
O dedi gün çıxdı
Mən isə yazdım.

## ÜFÜQLƏR

*Qürbətdə qərib şadman olmaz imiş,*
*Heç kimsə qəribə mehriban olmaz imiş.*
***Füzuli***

– Bağdad üfüqləri çənli, dumanlı,
Vətən üfüqləri necədir, görən?
Ürəklər, diləklər ahlı, amanlı,
Qərib bir yolçuyam bu yollarda mən.

Həsrətdir üfüqlər şəfəqə indi,
Gedirəm sehirli, sirli aləmdə.

Deyirəm: çataram üfüqə indi,
Silinər qəlbimdən kədər də, qəm də.

Gedirəm, üfüqlər gedir mənimlə,
Üfüqlər ardında üfüqlər durur.
"Həyat zarafatmı edir mənimlə?"
Hər kədər dalında min kədər durur.

Böyükdür arzusu eşqin, sənətin,
Diləklər çağırır xoş səhər kimi.
Yoxdur nəhayəti qəmin, həsrətin,
Bu sonu görünməz üfüqlər kimi.

Çox getdim, çox gəzdim, nələri gördüm!
Gah dayaza düşdüm, gah da dərinə.
Ömrün üfüqünə çatsa da ömrüm,
Çatmadım arzumun üfüqlərinə.

## EŞQ VƏ SƏADƏT

*Məndə Məcnundan füzun aşiqliq istedadı var,*
*Aşiqi-sadiq mənəm, Məcnunun ancaq adı var!*
***Füzuli***

– Çeşməli dağlardan, sulu dağlardan,
Keçdim məhəbbətin dağı sinəmdə.
İki rəng yaradıb görüm ki, dövran,
Qarası sinəmdə, ağı sinəmdə.

Eşqə ürəyimi pərvanə saydım,
Getdim yana-yana dünya üzündən,
Mən özüm min dəfə ağlamasaydım,
Leysan yağardımı Leyli gözündən?

Dərdli yollarıma çökdü qaranlıq,
Aya, ulduzlara açdım sirrimi.
Əgər sevməsəydim Məcnundan artıq,
Məcnunum bu qədər sevilərdimi?

Eşqin o çağlayan, coşan dənizi,
Gör necə dərindir, necə dərindir!
Dedim: sədaqətdir məhəbbət özü,
Dedim: məhəbbət də sadiqlərindir.

Toxundu atəşlər gülə, yandı ki,
Sevgini zarafat sanan olmasın!
Füzuli ah çəkib belə yandı ki,
Bir də onun kimi yanan olmasın!

## MƏNİM ÜRƏYİM

*Könüldə min qəmim vardır ki,*
*pünhan eyləmək olmaz.*
***Füzuli***

– Hər payız dərdimi pıçıldayaraq,
Tökülür ağacdan sapsarı yarpaq.
Dinlə, o həsrətlə səslənən qovaq,
Mənim ürəyimdir, mənim ürəyim.

Məhəbbət sonsuzdur, ömürsə qısa,
Nə ola, sədaqət əbədi qalsa!
Kimin ürəyində bir tel qırılsa,
Mənim ürəyimdir, mənim ürəyim.

Üzlərdə, gözlərdə sevgi oxunur,
Məhəbbət ürəkdən ürəyə qonur,

Gözəllər gözündə o atəş, o nur,
Mənim ürəyimdir, mənim ürəyim.

Bulağam, suyumdan doyunca için,
Çəmənəm, mehriban-mehriban keçin.
Min çiçək içindən bir lalə seçin –
Mənim ürəyimdir, mənim ürəyim.

Nəbinin qəlbində min bir dilək var,
Çələng toxumağa gül var, çiçək var,
Nə qədər dünyada sevən ürək var,
Mənim ürəyimdir, mənim ürəyim.

## ETİRAF

*Nə mülkü mal mənə çərx versə məmnunam,*
*Nə mülkü maldan avarə qılsa məhzunam.*
***Füzuli***

– Sevmədim dünyada qızıl-gümüşü,
Dedim ki, vüqarım etibarımdır,
Gözəl sevgilimin şirin gülüşü,
Mənim dövlətimdir, mənim varımdır.

Sevmədim dünyada şanı, şöhrəti,
Onları həyatda əfsanə sandım.
Bax, həmin dediyim varı, dövləti,
Öz ürək qanımla özüm qazandım.

Axtarıb gəzərəm könül yarımı,
Gəzərəm ömrümün baharı kimi.
İstəsə sevgilim göz yaşlarımı,
Düzərəm boynuna mirvari kimi.

Nadan qulaq assın qoy yaxşı-yaxşı,
Sevgi sevincimdir, sevgi qəmimdir.
Bir ala gözlünün odlu baxışı,
Mənim cənnətimdir, cəhənnəmimdir.

Nəbiyəm, bir dağam başı qarlıyam,
Demə: zirvəmdəki o duman nədir?
Bütün varlılardan daha varlıyam,
Dövlətim məhəbbət, varım sevgidir.

## SƏBA YELİ

*Nə yanar kimsə mənə atəşi-dildən özgə,*
*Nə açar kimsə qapım badi-səbadan qeyri.*
***Füzuli***

– Qapımı döydülər, "Buyurun" dedim,
Səslədim, içəri gələn olmadı.
Qapımı astaca bəs kim açdı, kim?
Gözlədim, içəri gələn olmadı.

Xəfif səs eşitdim yanımda birdən,
O səs haradansa mənə tanışdı.
Dayandım, ayağım qopmadı yerdən,
Sanki dilə gəlib kimsə danışdı:

"Kiçik damla" idim Kür çayında mən,
Yazda buxarlanıb qalxdım dağlara.
Yoruldum bu uzaq yollarda, bəzən,
Qondum, dincəlməkçin, göy budaqlara.

Bir günsə qoşuldum səba yelinə,
Elə bil Kür özü mənimlə gəldi.

Doğma şairimin uzaq elinə,
Xalqın ürək sözü mənimlə gəldi.

Dinlədim... Gözümdən
Keçdi duman-çən,
Çağladı könlümün eşqi, həvəsi.
Dedim: "Səba yeli, sən xoş gəlmisən,
Ey Odlar yurdunun sərin nəfəsi!"

Dilində Vətənin səsi, sorağı,
Dağımı, daşımı dolaşdın mənim.
Kədərli, qüssəli bu səhər çağı,
Yaxşı ki, qapımı sən açdın mənim!
Zülmət çulğalayıb həyat yolumu,
Dünya acımayır ürək ağrıma.
Gəl, gəl, geniş-geniş açım qolumu,
Səni, səba yeli, basım bağrıma.

...Qəmləndim, sevindim, ağladım, güldüm
Süzüldü göz yaşım yanaqlarıma.
Sanki Vətənimlə üz-üzə gəldim,
Dəydi Kürün suyu dodaqlarıma.
Səsləndi riqqətlə sinəmdə ürək,
Sandım könül sözüm dünyaya çatdı.
O gün səba yeli yorğun yolçutək
Elə bil baş qoyub qəlbimdə yatdı.

...Füzuli danışdı,
                    Füzuli susdu,
Duydum nəfəsini ilk bahar kimi.
O şerin, sənətin vüqarlı dostu
Çəkildi, gözümdən xəyallar kimi.

O məni dindirdi şirin dil ilə,
Sonra şəfəq olub o uçdu, getdi.

Elə bil gəlmişdi səba yeliylə,
Səba yeliylə də sovuşdu getdi!

Baxdım... Sakit otaq...
                              Yenə təkəm mən,
Bəs niyə qəlbimdə atəş var indi?
Kimsə yox... Amma ki, görüşümüzdən
Durur bu şeirlər yadigar indi.

*1958.*

# KİTABLAR VƏ ƏZABLAR

(*Poemadan parçalar*)

## Mənə doğmasınız, mənə yadsınız!

Kitablar – həyatda
yanar işıq tək,
Səması ucadır,
üfüqü sonsuz.
...Bir vaxt əlinizdən
tutdum uşaq tək,
İndisə əlimdən
siz tutursunuz.
Kitab səadətdir,
kitab zülümdür,
Kimə ölməzlikdir,
kimə ölümdür.
Ürək səsi gəlir
səhifələrdən,
Qandan damla-damla
sızan sizsiniz.
Məgər mən yazmışam,
sizi məgər mən,
Mənim bəxtimi də
yazan sizsiniz.
Kitab kim deyir ki,
şöhrətdir yalnız.
Kitab məgər ömrə
qənim deyildir?
Yox, sizin həyata
göz açdığınız
Yuxusuz gecələr
mənim deyildir!
Ey mənim, yox ikən
var olanlarım,
Var olub

Dünyaya
car olanlarım!
Niyə baxırsınız
soyuq-soyuq siz,
Məgər sinənizdə
Sönüb odunuz?
Doğulub göylərdə
səssiz-səmirsiz,
Bəlkə də hazıra
nazir oldunuz?
Bunu bacarmazdı
şair olan kəs,
Siz ki, yoğruldunuz
sehrdən, sirdən.
Siz bir saraysınız –
məğrur, müqəddəs
Onu mənmi tikdim
sözdən, sətirdən?
Mənə doğmasınız,
mənə yadsınız.
Siz ki, məndən ayrı
bir həyatsınız.
Duyğular –
şübhənin məngənəsində,
Bəzən sürünmüşəm
mən dizin-dizin.
Doğma oxucular məhkəməsində,
Tənqid mənim olub,
tərifsə sizin.
O qədər doğulub
naşı misralar,
Əlimlə onlara
məzar qazmışam.
Gəlib ilahidən
yaxşı misralar,
Ancaq pislərini
özüm yazmışam.

Müqəddəs kitablar,
əziz kitablar,
Nə söz götürmədim
mən sözdən ötrü.
Məndən ömür alan
mənsiz kitablar,
Əsdim yarpaq kimi
mən sizdən ötrü.
Tanrım, bu sözü də
cahana çatdır,
Sevgi qəlbdə olsun,
üzdə olmasın.
O xalq azaddır ki,
dili azaddır!
Qoy söz azadlığı
sözdə olmasın!
Bir dostun əlindən
üzülüb əlim,
Fikrini yad etmək
fəqət mümkündür:
– Sabah öləçəksə
əgər ki, dilim,
Ey Tanrım,
Sən məni
bu gündən öldür.
Gün keçir,
İllərin
gur dalğasında,
Bağlıyam şerə mən,
şeriyyətə mən.
Bir ulu məbədin
astanasında,
Gəlirəm əbədi
ibadətə mən.

## Dilə ibadət

Sənsən ucalığım,
sənsən qürurum,
Mənim ayrılığım,
görüşüm də sən.
Gecədən süzülən
ağappaq nurum,
Gündüzdən boylanan
Günəşim də sən,
Ay ana dilim!
Göylər layla desin,
dağa baş qoyum,
Mənim intizarım,
nigaranımsan.
Həsrət səhrasında
bir içim suyum,
Sevgi qitəsində
gur ümmanımsan,
Ay ana dilim!
Səndən uzaqlarda
biz qaldıq yetim.
Ancaq səslənirdin
yuxularda sən.
Bəlkə müvəqqəti məğlubiyyətim, –
Amma ki, əbədi bir təntənəmsən.
Ay ana dilim!
Yaralar təzədir,
yaralar dərin,
can qoyduq, tər tökdük
elimiz üçün.
Dilini kəsdilər
Dil deyənlərin,
Dil deyib ağladıq
dilimiz üçün,
Ay ana dilim!

Xoşdur hər çəmənin,
çölün öz gülü,
Çəmənlər gül açsın
baharla, yazla.
Gəlin yaxşı bilək
biz iki dili,
Ancaq, ikidilli
olmayaq əsla!
Ay ana dilim!
Durur arzularım
hələ gözümdə,
Neçə deyilməmiş
söz də qalıbdır.
Uca bayrağımsan,
dünya üzündə,
Səndə güllələrdən
iz də qalıbdır.
Sənə nankorluqdan
min qəlpə dəyib,
Dilə dəyən yara
hər qəlbə dəyib.
Ay ana dilim!
Dil özü –
Ən böyük
möcüzədirsə,
O alıb gücünü
doğma xalqından.
Dostlar öz dilinə biganədirsə,
Nə umaq yadların
soyuqluğundan,
Ay ana dilim!
Əzizdir öz yurdum,
torpağım mənim,
Mən ki, vətən deyən təriqətdəyəm.
Ucal, ey müqəddəs
bayrağım mənim,
Önündə əbədi ibadətdəyəm.

Məni bu səcdədən
ölüm ayırar,
Sonra diz çökəcək
övladlarım var!
Ay ana dilim!

**Sözə ibadət**

Əsrlər atını
erkən çapanda,
Göylər yazılmamış
mavi kitabdı.
Bəlkə insan oğlu
odu tapanda,
Sevincdən, heyrətdən
ilk sözü tapdı.
Zaman həm qəzəbli,
həm mehribandır,
İlk sözü yaradan
ilk yaradandır!
Bəzən illər ilə
gəzdim hər sözü,
Sözlər çıraq-çıraq
alışandımı?
Mənə pıçıldayan
bu qədər sözü,
Daşan sel,
Axan çay,
göy ormandımı?
Hər sözün rəngi var,
hər sözün ətri,
Mən sözü,
Söz məni
məhrəm sandımı?
Mənə pıçıldayan
bu qədər sətri,

Yerdimi, göydümü,
asimandımı?
Onları mən yazdım
desəm düz olmaz,
Bir qəlbdə bu qədər
axı, söz olmaz!
Sözlər –
göz-göz sızan
bulaqlar kimi,
Tələsir gur axan
bir çaya dönsün.
Sözlər –
göz-göz yanan
ocaqlar kimi,
Ürəklər odundan
nura bürünsün!
Sözlər –
göy ağacda
yarpaqlar kimi,
Qoy uca zirvədən
uca görünsün.
Mənə müqəddəsdir –
elin taleyi,
Ürəklər sözlərin
öz paytaxtıdır.
Millətin bəxtidir, –
dilin taleyi,

Dilin taleyi də
xalqın baxtıdır.
Ey söz –
ən ilahi
Vətənim mənim
Gücsüzlüyüm də sən,
qüdrətim də sən,
Sənsən dostum mənim,
düşmənim mənim,

İşığım da sənsən,
zülmətim də sən!
Elə ki, dilimdə
soluxur sözlər,
Sözümə əfsus!
Ürəksiz dedinmi
ox olur sözlər,
Oxlar da sancılır
Özümə, əfsus!
Sözlərlə ucalan
sənətə alqış!
Sənəti ucaldan
millətə alqış!

**"Kiçik təpə"nin böyük bəlası**

Bəlalı övladım
ay "Kiçik təpə"m,
Səni vərəq-vərəq
Gəl, bir də öpəm!
Üç il gözlərimin getdi qarası,
Şirin əzabımı
kim qaytarar, kim?
Sən "Kiçik təpə"min
böyük yarası,
İndi də qəlbimdə qövr edir mənim.
Görünməz düşmənlə
necə bacarım?
Bizim İttifaqda
nə hay-haraydı?
Hər vaxt gur danışan
sənətkarlarım,
Qapılar dalında pıçhapıçdaydı,
Qəzəb şərbətini
içdilər o gün,
Mənim damğam oldu:
"xalqın düşməni".

Nə kiçik qəlb ilə
ölçdülər o gün,
"Böyük müəllimlər"
"Kiçik təpə"ni.
Sinəm yaralandı
od güllələrdən,
İndi insan olan
buna tab gətir!
Səhifə-səhifə
məqalələrdən
Təhqirlər yağırdı,
sətirbəsətir:
– Mənzum roman yazır,
dünənki uşaq,
Yazır lap yalandan,
qələtdən yazır.
– Bundakı boya bax,
cəsarətə bax,
Qürbəti görməyən
qürbətdən yazır.
(Onda düşünəsən
belə sən gərək:
Ölüdən yazmaqçın
öləsən gərək).

"Nəbi nə ədayla meydana girdi,
Hələ ki, sənətdə bizim meydandır.
Qoymayın o şerə bəyi gətirdi,
Hələ bəy oğlu da baş qəhrəmandır".
Necə dolu kimi yağdı böhtanlar,
Qırdımı bir gəncin əqidəsini?
Bəlkə bir vaxt əli qana batanlar,
Belə batırarmış şerin səsini.

– Kim deyər yolunu
azmayıb Nəbi,
Bizim dövrümüzə
bietibarmış.

– Bunu təsadüfən
yazmayıb Nəbi,
Bəylərə xanlara
rəğbəti varmış.
– Görən keçmişindən
nə çıxar baxsan.
O bəy nəslindəndir
özü də yoxsa?
Mənzum roman yazsın,
ziyanlı, uzun,
Özü də İttifaq
katibi olsun!
Böhtan yağdırıldı
mənim adıma,
Sözün ağasısan,
şerin qulusan.
Bir şair nidası
düşdü yadıma
"Bəy oğlu, deməli, köpək oğlusan!"
Ürək!
Necə dözdün
itihama sən?!
Günahsız müqəssir!
Bu necə işdi?
Yaxşı ki, o zaman
37-dən
üç dəfə 7 il
ötüb keçmişdi.
Yoxsa qarışardı
halal-haramla
Qaça bilərdikmi təzə dəhşətdən?
Hələ yazılmamış
kitablarımla,
Əbədi susardım,
yarı yolda mən.
Beləcə az qaldı
dara çəkilim,

Özüm müttəhimdim,
sözüm vəkilim.
Hər misra qaldırdı
Bir sipər kimi,
Hər misra qaldırdı
Çılğın səsini.
Onda Mehdi Hüseyn
cəngavər kimi,
Gərdi hücumlara
öz sinəsini.
Səni axtarıram,
çatmayır əlim,
Baxıram, gur işıq bir anda sönür.
Sənə rəhmət olsun
Mehdi müəllim,
İllər arxasından
yerin görünür.
Yox, yox sağalmamış
qəfil yaralar,
Dalğa çəkilsə də,
izləri qaldı.
Fəqət ürəyimdə
təskinliyim var,
Mən "düşmən" olduqca
dostum çoxaldı.
Məktublar...
Hər məktub
Bir qanaddımı,
Məktub – sevinc dolu
Kainatdımı?
Atəşli əllərdən
isindi canım,
Sözü dəstə-dəstə
Nərgizlər dedi.
O, kişi qeyrətli
Mirvarid xanım,

Zərif cəsarətlə
mərd sözlər dedi,
İllər – haqsızlara
"sağ ol" demirlər,
Çoxu sual qoydu
əsrin adından,
Abbaslar, Famillər,
Əhməd Cəmillər,
Sonra İsmayıllar,
sonra Qabillər,
Məğrur cavab verdi
nəslin adından.
Məhrəm duyğuların
mənəm möhtacı,
Dünyaya məlumdur,
Məlum dostlarım.
Yaşayan dostlarım
başımın tacı,
Məğrür abidədir,
mərhum dostlarım.
Gecə də, gündüz də
gəlirəm yenə,
Mən o heykəllərin
ibadətinə!
Əsirmi illərin
soyuq yelləri?
Dumanmı yüksəlir
ömür dağından?
Axı otuz yaşlı
gəncin kədəri,
Susmur otuz ilin
uzaqlığından.
Susmur, haray çəkir,
bu gün biz barı,
Mehriban söykənək –
ürək-ürəyə.

Bir daha nəsillər
        görməsin deyə, –
O ağır
Dəhşətli
        ittihamları!
Bir də söyləməyək
        sonradan, – əfsus!
Ey böhtan,
Bir dayan,
Ey ittiham sus!
Hər şeyi yerbəyer
Etmirmi zaman?
Haqsızlıq yükünü
        həqiqət çəkir.
...Kimsə xəcalətli
        getdi dünyadan,
Kimsə lap bu gün də
        xəcalət çəkir.
Ömrü uzun olsun
        təki onların,
Yenə görüşürük
        biz dostlar kimi.
Çoxdan əfv etmişəm,
        mən ki, onları,
Görəsən oxucum
        əfv edəcəkmi?

## **Gecənin qoynunda bu görüş nədir?**

Gecənin qoynunda
        bu görüş nədir?
O, gəlir qüdrətli
        hökmran kimi.
Gözümü yumdummu
        o mənimlədir,
Yer kimi, göy kimi,
        kəhkəşan kimi.

Bilmirəm heç hardan
O peyda olur,
O atlı,
Fikrimsə
Piyada olur.
Dinir öz inamı,
Öz məntiqilə.
Ondadır ədalət,
Məndədir xəta.
Onun gecə yarı
Söz məntiqiylə,
Bütün həqiqətlər
yetir isbata.
O açır torpağın,
göyün sirrini,
Məni də özüylə qanadlandırır.
Dəyişir Ay ilə
Günün yerini,
Zöhrə ulduzunu
Axşam yandırır.
Deyir: –Qeyrətdədir
İnsan hünəri,
Deyir: – Özündən küs
Baxtından əvvəl.
O dinir...
Dünənim
Qayıdır geri,
Gəlir, gələcək də
Vaxtından əvvəl.
Deyir: – Yazılsa da,
göylərdə baxtın,
Sənin taleyindir –
sənin torpağın.
Sözlər büllur kimi,
sözlər tərtəmiz.
Onun müqəddəsdir

Gözlərində nur,
bəzən toqquşduqca
fikirlərimiz,
uzaq ulduzlardan
qığılcım qopur.
Qoşa dolanırıq
dağda, aranda,
Sözü düz demədin,
acığı gəlir.
Əfsus ki, o gedir
dan qızaranda.
"Yat" – deyir,
bəlkə də
yazığı gəlir.
Qalır onun daşdan
keçən məntiqi,
Səhərin nuruna
bürünür aləm.
Gündüz məndə olsa,
gecə məntiqi.
Mən bütün dünyaya
əncam çəkərəm.
Gecə... Asimanda
ulduzlar titrək,
Gecə... Yuxu qaçır
yenə gözümdən.
Gecə... O gələcək.
indi gələcək.
Gecə... Qorxurammı
özüm-özümdən?
Yox, yox gözləyirəm,
Yox, yox səsləyirəm.
Yenə səninlədir sözüm-sovum, gəl,
Mənim məndən müdrik
Filosofum, gəl!

## ANA

(*"Ana", "Bacı" və "Ömür yoldaşı" üçü birlikdə "Əbədiyyət poemaları" adlanır*)

Uca zirvələrin
                    ucası anam,
Əsrin bəyaz saçlı
                    qocası anam!
Batıb günəş kimi,
Solub ay kimi
İllərin qaranlıq dumanında o.
Elə bil yol keçib
Daşqın çay kimi
Dincəlir qocalıq ümmanında o.

Bu axşam saçlarımda
Gəzdi ana əlləri,
İsti ana əlləri.

Boz çinar yarpağıdır
O göy damarlı əllər,
Bir evin dayağıdır
Doğma
Qabarlı əllər!

Üstümdə zaman-zaman
Əsdi ana əlləri.
Neçə dərdin yolunu
Kəsdi ana əlləri,
İsti ana əlləri.

Yenə də saçlarımda
Gəzdi ana əlləri.
Titrədi yarpaq kimi,
Əsdi ana əlləri.

Aşdım uzaq illəri,
Nur yağdı göyə, yerə,
Məni bir qonaq kimi
Uşaqlıq çağlarına
Apardı birdən-birə
İsti ana əlləri.
Yenə də saçlarımda
Gəzdi ana əlləri.

O əllər
        qayğılı,
                sakit, mükəddər.
Düşünür...
Anamın fikri hardadır?
İndi xəyalında qalsa da rənglər,
Gözünün şəfəqi xalılardadır.
Hər xalı
Anamın nurlu xəyalı.
                ..."Sarı rəng – nar qabığı...
                Qara rəng – qoz yarpağı..."
O əllər
        bir qəlbin
                nəğmələrini
Dindirib rənglərə işıq verərdi.
O əllər
                hananın ilmələrini
Arfa telləritək dilləndirərdi.
Yenə tellər kimi
Dillən, ay əllər,
Rənglərin dilini bilən ay əllər...

Öpdüm diz çökərək
                o əlləri mən,
Anamçün kainat zülmətdir bu gün.
Yerə işıq verən,
Göyə nur verən
Dünya işığına həsrətdir bu gün.

O baxır...
Xəyallar o qədər şirin...
Gəlir yuxusuna gül də, çiçək də,
Təbiət,
Nə böyük qəbahət etdin
Ana gözlərinə qəsd eləməkdə.

O yumur gözünü,
Gedir qocalıq...
Günəşli asiman
Göz önündədir.
O açır gözünü,
Zülmət... qaranlıq...
Qaranlıq bir cahan göz önündədir.

O yatır,
Baxanlar deyir, bəlkə də
Bəyaz çarpayıda
Bir qarı yatır.
Qocalıq bağına
                    düşən kölgədə
Həyatın xəzanlı baharı yatır.

Beş ay keşik çəkən
                    üç bacım mənim –
Ona üç övladı,
Ona üç həkim,
Qayğı –
                    üç bacının düşüb payına...
Qayğı –
                    alındakı inçi tər kimi.
Üç bacı –
                    Quruyan ömür çayına
Pərişan əyilən söyüdlər kimi.

Əriyir
Sükutda
                    vaxt gilə-gilə...

Bacılar növbəylə mürgüləyirlər.
Onlar
öz yuxusuz
gecələriylə
Ana yuxusuna
Keşik çəkərlər!
Üç zərif qanaddır
Anaya üç qız.
Anam asta-asta bir səhər dedi:
– Qızlar,
Əllərimə xına qoysanız...
Bəlkə də yanğımı götürər, – dedi.
Bir zaman ilməli,
Hanalı əllər,
İndisə gəlintək
Xınalı əllər!
Elə sevinc vardı onun səsində,
Qaldırdı əlini – oğlum, bax, – deyə.
Elə bil
Son vida
kəcavəsində
Anam tələsirdi gəlin köçməyə...

Hara tələsirdi?
Sonsuz zülmətə?
Hara tələsirdi?
Əbədiyyətə!
Onunçün ay çıxmır,
Gün əyilməyir,
Qatı duman tutub
çölü, çəməni.
Həyatda məni də görə bilməyir,
Yalnız yuxularda o görür məni.

Görür... yolum kəndin
İçindən keçir,
Dönür uzaqlardan
yanıma illər.

O görmür
Saçıma necə dən düşür,
Necə yazı yazır alnıma illər!
Dolaşır saçımda
                    əlləri yumşaq...

Dillənir:
– Uşağım sınıxıb deyən.
Uşaq,
üç uşağın
Atası uşaq,
Sakit dayanmışam qarşısında mən.
Ana, yerin vardır
Gözlərim üstə...
Elə istədim ki, uşaq olum mən...
Bir də uyumaqçın dizlərin üstə
Uşaq olum mən.

Ömrünün yaz çağı
Qayıtsın deyə
Elə istərdim ki, uşaq olum mən.
Gözünün işığı qayıtsın deyə
Uşaq olum mən.

Bir daha laylanı eşitmək üçün,
Elə istərdim ki, uşaq olum mən.
Sən məni bir daha böyütmək üçün
Uşaq olum mən.

Səni uca tutum
Cahanda, ana,
Mənə arzu da sən,
Qanad da sənsən.
Sən özün savadsız olsan da, ana,
Mənə ilk müəllim
Həyatda sənsən!

Yazan taleyimi
Titrək əlindir.
Dilim,
Ana dilim
Sənin dilindir!
İlhamım su içib
Sənin qəlbindən,
coşub dalğalanıb
Arzu ümmanı.
Bakıdan uzağa
Getməsən də sən,
Gəzmisən mənimlə
Bütün dünyanı.

Ana, ilk zərrəsi doğma vətənin
İsti qucağından
Başlanır sənin.
Gəzdim yer üzünü
Mən ölkə-ölkə,
Xəyallar dolaşıb
Sən – deyə gəldi.
Gördüyüm hər diyar
Mənimlə birgə
Sənin ayağına səcdəyə gəldi!

Söylə, günəşmisən
Dünya üzündə?
Həyat
Şəfəqinə, nura boyana!
Verdiyin məhəbbət,
Nifrət üçün də
Sağ ol, ay ana!
Mənim düşmənimə
Sən ilk düşmənsən!
Mənim dostumunsa
İlk dostu sənsən!
Qoy dinsin sevənlər

Ana dilimdə,
Hər kəsdə ana tək
Etibar olsun,
Mənim sevgim üçün
Qoy sevgilim də,
Ay ana,
Tək sənə
                    minnətdar olsun.

O gün ki,
İlhamla
                    verdik əl-ələ,
Əbədi atəşlə
Odlandı sinəm.
Dünyada sevinci dəqiqələrlə,
Əzabı illərlə ölçülən mənəm.
Bir anın kədəri
Yüz saatındır,
Hardadır
Narahat gecənin sonu?
Sanki mənim üçün yuxu satındır,
Ömrüm bahasına alıram onu.
Uçub
          ulduzlara
                    çatıram bəzən,
Mən yerdən
Göylərə gedən
                    sorağam.
Elə səksəkəli yatıram bəzən
Yuxuda görürəm
Yenə oyağam!

Belə yaranmışdır
Şairlər, belə!
Dünyanın danışan dilləriyik biz.
Kainat tarının
Zaman əlilə

Tarıma çəkilmiş
                    telləriyik biz.
O tellər,
O tellər,
Elə kövrəkdir!
Xəfif yel əsdimi
Səslənəcəkdir!

Keçirik...
İzimiz
Aranda, dağda,
Dolama yolları ömür sayırıq.
Əgər kəndirbazlıq bacarmasaq da,
Əsəblər üstüylə addımlayırıq.
Bir ümid iziylə
Min xəyal keçir.
Yollara baxdıqca
Mən yana-yana,
Bəzən
Ürəyimdən
Bir sual keçir:
Niyə şair doğdun
Məni, ay ana?
Mühəndis olsaydım
Pis olardımı?
Qırçın
                    qayalarla
                    qardaş olardım.
                    qarlı zirvələrdə
                    qurub çadırımı
Sehirli dağlara sirdaş olardım.
Bəs həkim?
Ürəyim
                    Nura dönərdi
Sönən ömürlərin qaraltısında.
Həyat ulduz-ulduz

Şəfəqlənərdi
Cərrah bıçağımın parıltısında.
Süzülür
Qəlbimə
Min nəğmə,
Min səs...
Yer də,
Göy də dinir
Qəlbim dinəndə:
Niyə pianoçu
Doğulmadım bəs?
Üzeyir,
Bethoven
Yaşardı məndə.

Almaqçün
İlhamın
Lal sirlərini,
Dərələrdən keçib
                Dağlara qalxdım.
   Sənətin
Köləlik zəncirlərini
Taleyin qoluna
                könüllü taxdım.
Ömrün yollarında
   Mən axşam-səhər
   Sanki tələbəydim
                əli kitablı...
Şeirli günlərim –
Əzablı günlər,
Şeirsiz günlərim –
                daha əzablı.
Bir damla
Olsam da
Ümman cahanda,
Qəlbimə ümiddən
                düşən iz oldu.

İnsan yerə,
göyə
sərhəd qoyanda
İlham məmləkətim
Sərhədsiz oldu.
Mən qanad açdıqca,
Yer üzərində
Hər arzum parladı kəhkəşan kimi.
Mən özüm
"Köləlik"
zəncirlərində,
Şerim
ürəklərə
hökmran kimi.

Yazıram...
Qəlbimdə
inam var mənim!
Ata bərabəri
anam var mənim!
Həyatda ilk dahi
elə anadır!
Dünyanın Allahı
elə anadır!
Dağları görürəm
ana vüqarlı,
Dağlarda
Bir ana
ucalığı var.
Anama baxıram –
saçları qarlı,
Anamda dağların
qocalığı var.
Ana həyat sözüm,
ömür səsimdir,
Anamın nəfəsi
mənim bəsimdir!

Birdən
                    elə bil ki,
                    yenə uşaqdım...
Analı uyudum,
                    Anasız qalxdım.
                    Həyat səhrasıyla
                    Yol alıb gedən
                    Nağıllar karvanı
                    Dayandı birdən...
Birdən illərimə yağdı ağır qar,
Susdu ömrüm boyu dinən laylalar.
Bir daha qalxmadı
                    mehriban əllər,
O məni
                    Günəşə
          qaldıran əllər!
Solğun baxışlarla
          o dedi, ancaq
Ömrün ilk sözünü,
          son mənasını.
Axır nəfəsində pıçıldayaraq,
Anam da
Çağırdı
          öz anasını.
Ömrə sərhəd qoydu
                    bir an...
                    bircə an...
Ürək səksəkəli,
                    ürək aramsız
Bir əsr
          köç edib
                    getdi dünyadan,
Gələcək əsrlər
Qaldı anamsız.
Əsrlər
          dillənib
          haray saldılar,

Əsrlər
    mənimtək
    yetim qaldılar!
Dünya gecəlidir,
Dünya gündüzlü...
Əsrlər dilləndi
            ürəyi sözlü:
– Böyütdü qoynunda
səni mehriban,
Anan –
Anaların
            anası,
            anan!
Analar hünərçün
    övlad doğsa da,
Özü analığın
    böyük hünərdir.
Bəli, anaların yaşı dünyada
Elə əsrlərin yaşı qədərdir.
Övladlar ayrıldı
    öz anasından
Yetimlik üz verdi
            şerə, sənətə:
Adlayıb
ölməzlik astanasından
Bir ana qovuşdu əbədiyyətə!

Meh əsdi...
Ah çəkdi dağlar dərindən,
Göylər təmiz-təmiz
Tökdü qarını.
Analar
Gedəndə
Yer üzərindən
Bizə miras qoyur
            öz vüqarını.

O yatır, balışı
yer kürəsidir,
Büllurdan sarayı
göy qübbəsidir.
Evlə ana qəlbi
birləşsin deyə,
Hərdən göy qurşağı
çəkilir göyə!
Gərək ki, yanına mən tez-tez gələm,
Sənə ürəyimi
mən açam yenə.
Sağamsa,
mən sənə canlı heykələm,
Öləndə
sənətim heykəldir sənə!
Onunçün deyirəm,
Ey əziz insan,
Yaxşı ki, sən məni şair doğmusan!

İndi düşünçəli,
qəmli anımda
Gəlib böyük qızım
durur yanımda.
Saçımda qızımın
gəzir əlləri...
Sanıram gəncliyim
qayıdır geri...
Qızım anamızın
Sorağı kimi,
Ulu bir çinarın budağı kimi.
Qızım Pəri xanım...
Baxıram ona...
Nədir dünyadakı bu qəribə sirr?
Bizə varlığını
bəxş edən ana
Bizə adını da qoyub gedibdir!
O qoyub dünyada

Oxşarlığını,
Baxışı
nəvələr
gözündə qalır.
Aparıb özüylə
qocalığını,
Gəncliyi qəlbimin özündə qalır,
Sözləri şerimin
sözündə qalır.

*1967–1969.*

## BACI

*Bacım Şirinə və hələ də gözü yolda*
*qalan bütün ana-bacılarımıza ithaf*

İllər cığır açır
  Onun saçında
Qış gedir,
Yaz gəlir,
  Bulanır sular.
Dayanıb taleyin
  Yol ayrıcında,
Görəsən nə qədər
  Gözləmək olar?!
Ümid ki, boy atır
  Xatirəsində,
Kül altdan közərən
  Arzu – diləkdir!
Ona elə gəlir:
  Yer kürəsində
Yaşamaq –
  Əbədi
          Bir gözləməkdir.
O gün necə gəldi,
O necə gündür?
Sevincdir, dəhşətdir,
  Qorxudur o gün.
İllər axarından
  Hayana döndü?
Bəlkə heç olmayıb, yuxudur o gün!

* * *

Sevinən səmadı,
          Sevinən yerdi,
Bir evdən
Sütuntək
  Qalxırdı tüstü.

Cavanlar əl-ələ
Yallı gedirdi,
Bir toy çalınırdı
Bir axşamüstü.
Dönmüşdü al-əlvan çiçəyə qızlar,
Ürəklər, dodaqlar
Nəğməli sözlü.
İlk xına qoymuşdu
Əllərə qızlar,
Bir toy çalınırdı
Bir axşamüstü.
Xonçalı gözəllər
Qatar-qatardı,
– Mübarək! –
Deyərək
Yengə də süzdü.
– Sağ əlin başıma –
Deyən də vardı,
Bir toy çalınırdı
Bir axşamüstü.
– Zurna cəngi vursun,
Segah desin tar!
Çalanlar şabaşın
İçində üzdü.
– Adə, bəy oynasın,
Ucuzluq olar!
Bir toy çalınırdı
Bir axşamüstü.
Xoşbəxtlik sonsuzdur –
Düşünür insan,
İnsan qoşa durar
Günəşlə, ayla.
Həmişə sükutla gəlsə də tufan,
Bu axşam gəlirdi
Haray-harayla,
Sevinclə, toyla.

"Anam, bacım, qız gəlin",
Hardasa, kim isə elə oxudu,
"Əl-ayağı düz gəlin..."
Səsi əsə-əsə elə oxudu.
Yer, göy də səs-səsə elə oxudu:
"Yeddi oğul istərəm,
Bircə dənə qız gəlin!"
Sevənlər səadət
İntizarında,
Necə yaraşırdı
Bu kəndə şadlıq...
Kim hardan biləydi
Elə bu anda
Talelər məcradan
Çıxmışdı artıq.
Tətiyi çəkmişdi
Faşist barmağı,
Zülmətdə od zolaq
Açırdı güllə.
Aşıb bir qırpımda
Çəməni, dağı
Ölüm deyə-deyə
Uçurdu güllə...
Bir oğlan oynadı
Güləş, mehriban,
Eşqi, məhəbbəti
Ləkəsiz oğlan!
O necə oynadı,
Necə oynadı?!
Gözündə şəfəqli
Gecə oynadı!
Sanki ayaqların
Gur səslərindən
Çıxdı yer kürəsi
öz məhvərindən.
Dəydi bir-birinə
Ulduzlar, aylar,

Susub məcrasında
Dayandı çaylar!
O, elə oynadı,
əl çaldı hamı...
Ürəyin ilk sevinç
Sorağındamı,
Ey əziz oğlan?
Qəlbinə tuşlanan
Odlu güllədən
Xəbərsiz oğlan!
Oyna,
Qiyamətdir,
Ay oğlan, toyun!
Nə geniş
Açmısan
Belə qoynunu?
...Axşamdan səhərə
Uzanan toyun
Sonsuz bir gecəyə
Qovuşdu sonu.
Arzu çəməninə
Vaxtsız əsdi qış
Zamanın zülmətli qaranlığından.
Gəlinlik duvağı
çıxarılmamış
Fəlakət qılıncı
Çıxdı qınından.
Ürəklər həsrətlə
Səsləndi tel-tel,
Bahara qovuşan
Nə qışdı
birdən?
Mehriban əllərə
Uzanan bir əl
Tüfəng qundağından
Yapışdı birdən.
Ömür yarı... gecə yarı.

Tale yarı...
Uzaqlarda qopan hərbin
Alovları
Bircə anda
Xırdalanda
Ürəkləri qarsaladı.
Ümidlərə qılınc çəkdi,
Arzuları, diləkləri qarsaladı.
Əsdi səmum küləkləri,
Əsdi ölüm küləkləri.
Bütün ölkə ölümü də
Məğrur-məğrur qarşıladı.
Ah, nə ağır səfər oldu!
Şairlər də əsgər oldu,
Aşıqlar da "Vətən" deyə,
Söz qoşdular, saz tutdular,
İnsanlar öz taleyini unutdular,
Düşündülər yanan dərə,
Solan çəmən taleyini,
İnsanlar öz taleyini unutdular,
Düşündülər ancaq Vətən taleyini.
Biz hardan biləydik
Belə olacaq?
Biz axı, hər yerdə zəfər çalırdıq,
İllərə zirvətək
Biz ucalırdıq.
Kinoda görmüşdük davanı ancaq.
Orda düşmən ölür,
Biz sağ qalırdıq.
Bizdəmi tuş gəldik
Kədərə, dərdə?
Bu ki, ağlasığmaz bir imtahandır.
Necə, ölə bilər
Bizimkilər də?
Bu bir kinodursa,
Sonu haçandır?

O neçə günlərdi?
Düşünürəm mən.
Sanki torpaq yanır,
Səma yanırdı.
Cəbhədə bir qəlbə dəyən gülllədən
Arxada min ömür
yaralanırdı.
Kağızlar
Od dolu
Qəlpələr kimi,
Uçurdu haradan hara kağızlar?!
Açıldı,
Sancıldı
Güllələr kimi
Sanki talelərə
Qara kağızlar!
Bir ana evindən
haray qalxdımı –
– İtirdim – deyərdi – oğul, baxtımı
Bir gəlin örtdümü
Qara yaylığı,
Deyərdi: – Evimin söndü işığı!
Bu evdə bu gündü...
O evdə dünən...
Yerin dəhşəti də
Sığmırdı yerə.
Bir anda
əl boyda
Kağıza dönən
Dönürdü min-milyon xatirələrə.
Heyhat,
Kitablarda yazıldığı tək
Asan deyilmiş ki,
Döyüşlər, asan!
Ağıl söyləyirdi:
O gəlməyəcək!
Ürəyi bəs necə inandırasan?

Nigaran-nigaran gəldi səs-səda,
Bəzən yanaqlarda
Yaş qurusa da,
Ürəyi bəs necə ovundurasan?
Ürəyi bəs necə inandırasan?

* * *

Adın Şirin oldu,
Taleyin acı,
Sənin, ay bacı!
Ayrılıq yolları,
İzləri kəsdi,
Dağlar sənə həsrət,
ümmanlar çaya...
Bəlkə Nizami də heç düşünməzdi
Səkkiz əsrlikdən –
Yenə dünyaya əsrin ümid qızı
Şirin gələcək,
Şirinin bacısı
Şirin gələcək.

* * *

Sən illər qoynundan uçan qanadsan,
Dözüm üfüqlərin
Nə qədər əngin!
Kim deyər işıqsız bir kainatsan,
Sönməz bir ümiddir günəşin sənin!
Ucalar yüksəyə
Köklər dərindən –
Çinartək kölgə də
Salar insanlar.
İnsanlar keçsə də
Yer üzərindən,
Ümidə çevrilib
Qalar insanlar.

Düzlər lalələrdən zərə büründü,
Yenə təbiətin
Çiçək ayıdır.
Davadan dönənlər
Bir dəfə döndü,
O isə min dəfə dönür, qayıdır.
Ümidlər gözlərin
Yaşını sildi.
Qəlbə unudulmuş duyğular gəldi:
"Qapıya kölgə düşdü,
Elə bildim yar gəldi".
O gəlir,
İnamla
Qəhrəman kimi.
Qardaş torpağından
Qalxaraq gəlir.
Görüşə gecikmiş
Bir oğlan kimi
O necə utancaq-utancaq gəlir.
Bu nədir?
Zamanın gərdişidirmi?
Gedər-gəlməzlərin
Gəlişidirmi?
O gəlir tüstüdə,
Dumanda gəlir,
Cavan getdiyitək
cavan da gəlir.
O gəlir nigaran
Qədəmlərilə,
üstündən illərin
yelləri əsir.
Elə bil mehriban
Qədəmlərilə
Yarımçıq qoyduğu
Toya tələsir!
Baxıb nə gördü o?
Bu necə sirdi?

Bir evdən
Sütuntək
Qalxırdı tüstü.
cavanlar əl-ələ
Yallı gedirdi,
Bir toy çalınırdı bir axşamüstü.
Bu günə
Nə qədər
Uzandı yollar!
Yerlər də sözlüydü,
Göylər də sözlü.
– Adə, bəy oynasın,
Ucuzluq olar,
Bir toy çalınırdı bir axşamüstü.
Oğlan gülümsədi,
Dayandı, baxdı,
Sanki əl götürüb oynayacaqdı...

* * *

Xəyallar yol alır
Xatirəsindən,
Xəyallar rəngbərəng,
Çiçək-çiçəkdir.
Ona elə gəlir
Yer kürəsində
Yaşamaq –
əbədi
Bir gözləməkdir!
Gör onun qəlbindən
Keçənlər nədir,
Fikirlər sonsuzdur,
Gecələr uzun.
– Nə qədər sağamsa o mənimlədir,
Ölsəm, məndən sonra canı sağ olsun!
Onun ev-eşikdən
Alar iyini,

O elə düşünər...
 O elə gözlər!
Yol alar qəlbindən
 Sükutla sözlər.
Adını ucadan
Çəkməz bir an da.
Qoruyub elə bil
Gözlədiyini,
Gizlədər fikirli baxışlarında.
İnamı –
 Bəxtinin əzəli kimi,
Bir əsrin
Özü var
Onun sözündə.
O, ümid, sədaqət
 heykəli kimi
Gəzər iftixarla
Torpaq üstündə.
...Günəşə boylanar
 Mehriban bacım,
Bahar şəfəqləri
Necə ılıqdır!
Mənim igid baçım,
 Qəhrəman bacım.
Gözləmək
Özü də
 Qəhrəmanlıqdır!

*1975–1977.*

## ÖMÜR YOLDAŞI

*Bütün vəfalı qadınlara və övladlarımın anası Güları̇yə ithaf*

Calandı gecədən
gündüzə illər,
əsrə taleyimi
nəqş etdi dünya.
Yaratdı nə qədər
möcüzə, illər
Mənə də möcüzə
bəxş etdi dünya.
Doğuldum,
göz açdım,
ağladım,
güldüm,
İlkin söylədiyim
"Ana" sözüdür.
Bizim möcüzəli
həyatda, bildim,
Ən böyük möcüzə
ömür özüdür.
Günəş – kainatdır,
Ulduz – kainat,
Bürclər də sehirli
qitələridir.
İnsana vətənsə
Sonsuz kainat –
Doğma yer kürəsi
Görüş yeridir
Ulduzlar nurlanır
Biri-birindən,
Parlayır gün kimi
cahanda insan.
Keçib arzuların

Zirvələrindən
Tapır öz baxtını
İnsanda insan.
Elə ki, üz-üzə
Çıxır oğlan, qız,
Bir görüş ağacı
Bitir dünyada.
Elə ki, qovuşur
İki atasız –
Yetimlik köç edib
Gedir dünyadan.
Qovuşur, həsrətli
Əllər qovuşur
Səcdə də bunadır,
Heyrət də buna.
Elə bil intizar illər qovuşur –
Tale də deyirlər,
Qismət də buna!
İnsan yer uzünün
Şahı olsa da,
Başlara qoyulan
Bir tacdır ömür.
Əgər ömür yolu
Uzaq yolsa da,
ömür yoldaşına
Möhtacdır ömür.

* * *

Yenə də arzular
Xatirələndi,
Haçandı o axşam,
Bəlkə dünəndi?
...Dinir asta-asta
yastı balaban...
(Artıq onu çalan
köçüb dünyadan.)

Nə çılğın sağlıqlar
Aşıb-daşırdı,
Nə sözlü-söhbətli
Tamada vardı.
Belə toy edirdi
Kəndim Xırdalan.
Kəndim... Şiş təpəsi
Oyum-oyumdur...
Kimsəyə demədim
O gün toyumdur.
Qoy bilən gəlsin,
Qoy gələn gəlsin!
Yığıldı qohum da
Dost da, tanış da,
Kəndim fərəhləndi
Toylu baharla.
Birgə oturmuşdu
Yuxarı başda
Doğma ağbirçəklər
Ağsaqqallarla.
O, bir işıq kimi
Girdi qapıdan,
Düşdü ürəklərə
Nur izi onun.
Bir üstü qırmızı
Mil-mil çamadan,
Bir də sevgisiydi
cehizi onun.
– Xoş gəldin, əlləri xınalı gəlin,
Ay utancaq gəlin, həyalı gəlin!
Gəldiyin yollara mən qurban gedim,
Yaxın gəl, ayağı sayalı gəlin!
Bu, gəlin həsrətli
ana səsiydi,
Onun bir dünyalıq
Gur nəğməsiydi!

Ana! Kirpiyilə
Odlar götürən,
Beş oğul yetirib
Bircə toy görən
Mərdanə ananın
Təntənəsiydi...
Ana müqəddəslər
Müqəddəsiydi!
Birləşdi qəlblərin
Arzusu, kamı.
Taledən-taleyə
Körpü salındı.
Dəbdəbə naminə
O toy axşamı
Ayaqlar altında
Bir nimçə sındı.
Nimçə xınçım-xıncım
O gün sınsa da,
Ürəklər sınmasın – dedik, – dünyada.

* * *

Qaranquşlar kimi
Gəldi övladlar,
Doğuldu mirastək
Saxlanmış adlar.
İki anam oldu
Mənim cahanda
Bir anam,
Bir qızım
Anam adında.
Anam bu dünyadan
Qış günü köçdü.
Qızıma tapşırıb
Ömrünü köçdü.
Elə ki, həyata gəldi Gülümsər,
Batdı təbəssümə
Yerlərlə göylər.

Sonra Arzu gəldi
Dünya üzünə
Təzə qanad verdi
Arzular mənə.
Sonrasa...
Boyandı
İllər qaraya...
(Bu "sonra" qoy qalsın azca sonraya).
...Kainat gündüzdür,
Kainat gecə,
Dünyanın sirləri
Düyün-düyündür.
Yuxusuz gecələr –
İkiqat gecə,
narahat gündüzlər –
Yarımçıq gündür!
Şair, bəs deyilmi
Köhlən çapdığın,
Nədir axtardığın,
Nədir tapdığın
Axtar duyğuları,
İtir yuxunu,
Coşsun fikirlərin dəli çovğunu.
Böyük həqiqət var
Sevgi soraqlı,
Ağlın ürəyidir –
ürəyin ağlı.
Sükutla söz gəzdim
mən səhərədək,
O açdı sabahı
Layla deyərək.
Əzabla misraya
Düzdüm sözləri,
Gözəl övladlarla
O yazdı şeri.
O axı, anadır
Axı, anadır.

Şerin, şeriyyətin yaradanıdır.
Dünyada nəsil çox,
Qərinə çoxdur,
Səhərlər,
Axşamlar
Durur yanaşı.
Yarəb, yer üzündə
Qadın nə çoxdur,
Yaxşı ki, təkcədir
Ömür yoldaşı!
Həyatda mərdlərin
Əhdi qırılmaz,
Ürək mətin olsun,
Söz etibarlı.
Kişinin papağı
Yerə vurulmaz
Qadını olarsa
Kişi vüqarlı!

* * *

– Bu gün yetim qaldı kənddə bir uşaq.
Amansız taleyin işlərinə bax!
– İlkin "ana" dedi qonşu körpəsi,
Ananın sevincdən titrədi səsi,
Özgə taleləri
ona yad deyil,
Yad ömrü ömrünün yarısı oldu.
– Yaxşı ki, Firuzə gözlədi on il,
Tamarzı olmadı,
Bir qızı oldu!
Başımız ağrıdı –
Ağrı onundu.
Dişimiz ağrıdı –
Ağrı onundu.
Özü ürəyini tutsa da, bizim –
Durdu keşiyində ürəyimizin.

Dini, imanı da
Uşaqlarıydı,
Uşaqlar
Ən nurlu
İşıqlarıydı.
Sanki mən
Dünyaya
Təzə doğuldum,
Uçmağa göy verdi,
Qanad verdi o.
Ən böyük uşağı
Onun mən oldum,
ən böyük əzab da
Məndən gördü o.
İsindik biz onun
hərarətilə,
Sanki heç yağmadı
Qışların qarı.
...Bilmədik
Nə sirdir –
Məhəbbətiylə
Gələn bəlanı da
Göydə qaytarır.
Bəlanı,
Dəhşəti,
Xəstəlikləri –
Qaytarır...
Qaytardı
Neçə yol geri...
Qaytara bilmədi
Yalnız bir kərə:
Onda vida dedik
Biz Ələkbərə.
Ayrıldı
Öz ata,
Öz anasından,

Dördüncü baharın
Astanasında.
O gün,
Çulğaladı
Günəşi, ayı –
Ana ağısıyla
Ata harayı:
"Ələkbər yanında yatan Ələkbər,
Atanın səsini bəlkə eşitdin.
Gözlədik yolunu
Sənin nə qədər,
Bu qədər gec gəlib, tez niyə getdin"?!
Dərddən bükülərmi
Ananın dizi?
Təkcə yaş tökmədi.
O, qan ağladı.
Kişinin ürəyi,
Qadının gözü
Bütün yer üzündən
Pünhan ağladı.
Sevinc istəyirsən –
Dərd olur nəsib,
Bala itirənlər –
Bəla tapırlar,
Üzlərdə,
Gözlərdə
Təskinlik gəzib,
Yenə sədaqətdən
Qala tapırlar.
Sanki tufan ötdü...
Bir sükut çökdü...
Nidasız haraydı
Oğul həsrəti.
...Qadın kədərindən
Daha böyükdür
Ana dəyanəti,
Ana qüdrəti.

Kədər sərhədləri
Olurmu sonsuz?
O yara sızladı
Dünənə kimi.
O yara sızladı –
Arzu oğlumuz
Arzu Ələkbərə dönənə kimi.
Səbrlə dəyanət
Elə üzləşir,
Sevinc etməyəni
Dərd edir bəzən.
Dərdə dözümlülər
Müqəddəsləşir,
Dərd də insanları
Mərd edir bəzən!

* * *

Yenə gəlib keçər
Baharlar, yazlar,
Analar
Küsməzlər
Talelərindən,
Əgər küssələr də üzə vurmazlar,
Baxmazlar əzaba,
Alın tərinə.
...Doğma universitet pillələrindən
O qalxdı
Analıq
Pillələrinə
hər övlad gülüşü –
Sirli bir səda,
Qəlbində bir inam,
Ümid doğuldu.
...Əgər o, məktəbdə
Dərs deməsə də,
Bütöv bir nəsilçün
Müəllim oldu.

Körpələr dil açdı...
Kama yetdi o.
Dilçilik etmədi,
Dil öyrətdi o.
Gələrək üz-üzə
coşğun həyatla,
Yelkənli qayıqtək
Çıxdı ümmana.
Hərdən belə dedi
O zarafatla;
– Bir ömur verilib
Əfsus, insana!
– O niyə?
– Əlbəttə, bu, arzulardır,
İki ömür olsa...
Bir özün düşün...
Biri ailəyə
həsr olunardı,
Biri də qalardı
Sənət, elm üçün.
Təbəssüm işığı
Qondu üzlərə,
Gülüşlər qarışdı
Gülüşə yenə.
Yenidən mən çıxdım
uzaq səfərə,
Tələsdim evimə –
Görüşə yenə.
Hayana getsə də
Şair, elindən –
Şairin ürəyi
öz evindədir.
Uzaq səfərdə də
Bilirdim ki, mən
Evimin dirəyi
öz evimdədir.

Cahan kitab oldu,
Səfərlər sətir,
Mən salam apardım
Neçə millətə.
Dostlar gülüb dedi:
– Nəbi gəlibdir
Bu gün öz evinə ezamiyyətə!
İllər qanad taxdı
Sözdən, sənətdən,
İlham oba-oba
Dadıma çatdı.
Hörmət çoxaldıqca
Artdı şöhrət də,
Paxıllar şöhrətdən
Daha tez artdı.

* * *

İllərin ardınca
İllər ötüncə –
Bu qalır mənimçün
Yenə sirr kimi,-
Girdi evimizə
Nə zaman,
Necə.
Qısqançlıq –
Ən böyük
Bir təhqir kimi.
Vurdu qılıncını
Çox dərindən o,
Qısqanclıq üzləşdi
İlk etibarla.
Başlanıb
Telefon
Zənglərindən o,
Dolaşdı ev – ara
Pıçıltılarla.

Necə narahatdı
Saatlar,
anlar,
Yollar
Ayrıcında
ömürlər durdu.
Üzbəüz çıxmağı
Bacarmayanlar
Nə gizli tellərlə
Tələ qururdu!
Heçdir üzr istəmək,
Yersiz küsəndən,
Bircə çarəsi var –
O dəyanətdir.
Sənət üz döndərdi
Elə ki, səndən,
Evlərə nifaq sal,
Bu da sənətdir!
– Hardaydın?
– Neynirdin?
– Sirri aç, barı!
– Ona niyə baxdın?
– O niyə baxdı?
Bütün yer üzünün
Gözəl qızları
Sanki vurulmuşdu
Mənə bu vaxtı.
Keçdim yoxuşlardan,
Yol aça-aça,
Məgər ki, sarsıtmaq
Asandı məni?!
Ona müqəddəstək
Mən inandıqca,
O, dağa-daşa da
Qısqandı məni...
Yalnız özüm kimi
özüm varam mən,

Bəzən ürəkləri
Mən qanatmışam
Nə deyim, bəlkə də
Günahkaram mən,
Burda ehtiyatsız
Addım atmışam.
Sən gəl, bu şairi
İndi başa düş,
Sükutu şirinsə,
dili acıdır...
Vaxtında təbəssüm,
Vaxtında gülüş –
Qadın ürəyinin ehtiyacıdır.
Bəzən məhəl qoymur
Yar sözlərinə,
Alovsuz,
Tüstüsüz
Alışır ki, o!
Sevdiyi qadını
Duymaq yerinə
Aylar, ulduzlarla
Danışır ki, o!
Şairin qəlbinə
Duman da çöksə,
İlk sözü,
Son sözü
Mehribanlıqdır.
Şairlik əgər ki,
Bir igidliksə,
Şairlə yaşamaq –
Qəhrəmanlıqdır!

* * *

Bəzən dara çəkir
Məni fikirlər.
Elə sözlər gəlir
Qəlbimdən mənim,

Dediyim duyğular
Yalansa əgər,
Yer də, göy də mənə
Qoy olsun qənim.
Qadın həyasını
Qoruduğutək,
Kişi qürurunu
Qorusun gərək.
Axı, bir yastığa
Baş qoymaqla sən,
Gərək bir ömürçün
Başdan keçəsən!
Gəlirsə bir gün ağ,
Bir gün də qara, –
Məhəbbət insanın
Varı-yoxudur.
Başlar baş qoyursa
Yad balışlara,
Başsız küləkdir o,
Başsız duyğudur!
Xəyanət dursa da
Bəzən tunc kimi,
Ədalət çəkilsin
Bir qılınc kimi.
Başını itirən
Baş əyib gəlsə,
Min yol üzr istəyər
Söz arasında.
Vəfasız kəslərin
Başı kəsilsə,
Kəsilsin evinin
Astanasında

* * *

Hərbin o dəhşətli
Od illərindən,

Nə qədər bir uzun
Qərinə keçdi?..
...Gecə səksəkəli
Qalxır yerindən:
– Yuxumda
Yanıma
Atam gəlmişdi!
Danışır,
Səsində
Qorxu, həyəcan,
Qövr edir min doğma
Söz ürəyində.
Ömründə davanı
Görməyən insan
Gəzdirir dəhşəti
öz taleyində.
Bir əsrin
Görüşsüz
Ayrılığından
Ata, yuxularda
Dönür elinə.
O, dörd onilliyin
Uzaqlığından
Toxunur qızının
Qara telinə.
Haçan o, qızıyla
Görüşüb, bilmir,
O qara tellərə
Dən düşüb, bilmir.
Qalır ömürlərdə
Hərbin tufanı
Açılır
Xatirə – qanadlar ancaq.
Qəbri yad ellərdə
Tapılmayanı
Tapır yuxularda
Övladlar ancaq!

Ölüm yağışları
Yağır torpağa.
Çağlayır köksündə
Hərbə nifrəti.
Özü ana olub
Neçə uşağa –
Yenə də qəlbində
Ata Həsrəti.
Çəkilsin evlərdən
Qorxu, təlaş da,
Axı, xoşbəxt günün
Əvəzi olmur.
İki ata ömrü
Sürən qardaş da
Bir ata ömrünün
Əvəzi olmur!

* * *

Nəvələr –
Evlərin
Şıltaqlarıdır,
Nəsil ağacından
Budaqlarıdır.
İndi nənə üçün –
mənası ömrün
Yanarla, Vüsaldır,
Sonayla, Elgün!
Elə ki,
Toplaşdı
Evə nəvələr,
Nənə də,
Nəvə də,
Elə kef elər!
Nağıl danışırlar,
Laylalı nağıl,
Bəzən olar haylı-haraylı nağıl!

Yanar:
– Sən ancaq laylanı mənə de, "ana"![*]
Vüsal:
– Ana, nağılımı pıçılda mənim!
Sonra da bu yandan
Hay çəkir Sona:
– Layla da mənimdir
Nağıl da mənim!
Elgün beşaylıqdır
danışmır hələ,
Deyir sözlərini
təbəssümüylə,
Onun bic-bic gülən
Gözlərinə bax,
Danışsa, onlardan
Betər olacaq.
...Əsir çilçıraqlar,
Titrəyir tavan,
Sona rəqs eləyir
Yerdə, divanda.
Yanar atəş açır
Avtomatından
Vüsal düz divara
Çıxır bir anda.
Nənə:
– Başıma uçurtdu evi uşaqlar,
Vallah, ürəyimi partladacaqlar.
...Çəkilir ümmanın
Gur dalğaları,
İncik baxışlarla
Gedir nəvələr.
Evi başdan-başa
Bir sükut sarır,
Marığda dayanıb
Güdür nəvələr.

[*] Onlar nənələrinə “ana” deyirlər.

Onlar yaxşı bilir,
Sabahdan yenə –
Qəlbini zənglərlə
Açacaq nənə!
– Canım-gözüm qurban,
Yanar necəsən?
Niyə gəlmirsiniz,
Belə iş olar?
Gəl, bağım, baharım,
Gözüm yoldadır!
...Yenə qopar evdə
Doğma bir tufan,
Əsər çilçıraqlar,
Titrəyər tavan.
İntizar
Çəkilər
Dumanlar kimi,
Bu görüş,
Bu şadlıq
Dünyaya dəyər.
Nənə gur çağlayan
Ümmanlar kimi
Dincələr
Dalğadan
Dalğaya qədər.
Baxar nəvəsinə...
Tez böyü barı!
Görər sabahı da
Boyunda onun.
Bəli, gələn əsrin
Vətəndaşları
Beləcə boy atar
Qoynunda onun.
Özü də körpəylə
Bir körpə olub
Ana nəsli, nəslə
Qovuşdurandır.

Zamandan-zamana
Bir körpü olub
Ana əsri, əsrə
Qovuşdurandır.

* * *

Əsrim!
O parladı
Günəşlə, ayla.
Əsrim!
O, yol açdı
Bəşər yazına.
Əsrimin mübarək
Addımlarıyla
Çatırıq bir əsrin
astanasına.
Tarixin –
Zəkası dərin əsrini
Bayraqtək
Yüksəldək
Ulu göylərə.
Bütün əsrlərin
Zərrin əsrini
Calayaq gələcək
Minilliklərə.
Gedirik,
Yolumuz
Müqəddəs, uca
Doğma ulduzlar da
halay-halaydı.
Əsrin sahilinə
Yaxınlaşdıqca,
Kaş ömrün sahili
Uzaqlaşaydı.
Bəşər bizə verib
Etibarını,

Bizimdir al səhər,
Parlaq gündüz də.
Aparaq
Bir əsrin
Analarını
Gələcək əsrə biz
Gözümüz üstdə.
Əsarət köç etsin
Yer kürəsindən,
Günahsız qanların
İzi silinsin!
Bütün insanlığın
Hafizəsindən
Kaş ki, müharibə
Sözü silinsin!
Arzular böyükdür,
Yollar da uzun,
Nəvə, nətiçələr
Çatsın murada.
Bütün intizarlar
Yerdən yox olsun,
Sevgi intizarı
Qalsın dünyada.
Parlasın ürəkdə
Büllur məhəbbət,
Aparaq
Sədaqət –
Sabahkı əsrə.
Qalsın bu əsrdə
Paxıllıq, həsəd,
Qoy keçsin nəcabət –
Sabahkı əsrə.
Ulduzlar
Qoynunda
Mürgüləyək biz,
Biz açdıq kosmosa
Nurlu bir qapı.

Bütün əzablara
Vida deyək biz,
Tək qalsın bizimlə
Sənət əzabı
Xəyalən
O günə
Qanadlanıram,
Görürəm, çəkilir
Qatı qaranlıq.
Sahildən o yana
Elə sanıram,
Başlanır sahilsiz
Bir mehribanlıq.
Baxır ümid ilə
Ulduzlar yerə,
Deyir: uzat mənə
Kömək əlini!
...Övladlar uçarkən
Sabah göylərə,
Aparsın özüylə
Ana şəklini!
Səma dənizləri
Qoy ləpələnsin!
Ana təbəssümü
Göyə çilənsin!
Uçsun ana qəlbi
Kəhkaşanlarda,
cahan daha nurlu,
Mənalı olsun.
Deyirəm, yetimdir
Ulduzlar orda,
Orda ulduzlar da
Analı olsun!

* * *

Baxış mehribandır,
Söz mehribandır,

Sevgisi – əbədi
Bir imtahandır,
Sənə təbiətdən
O, ərməğandır
Ömür yoldaşı!
Yanır ürəklərdə
Zərrəsi onun,
Nəvələr –
Ən sonsuz
Nəğməsi onun,
Yalnız o özüdür
Əvəzi onun,
Ömür yoldaşı!
Özü qızlarıyla
Ana qatarı,
Çoxalır bir daha,
Sana, qatarı:
Bir nəsil böyüdür –
Durna qatarı,
ömür yoldaşı!

* * *

Biz ki, qovuşmuşuq
Duzla, çörəklə,
Birlikdə bir ümman
Su içmişik biz.
Axı, nə görmüşük
həyatda hələ,
Elə ağır-ağır
Yol keçmişik biz.
Söykənək qururla
Oğula,
Qıza,
Övladlar böyüsün –
Sən deyən kimi,

Qumrular qonsunlar
Eyvanımıza.
Xeyir xəbər üçün –
Sən deyən kimi.
Bizimçin hardasa
gəlin bəslənir,
Kaş tezcə
Özünü,
Üzünü görək!
Sanki lap yaxında
Bir toy səslənir,
Bəlkə oynamaqçün
Biz əl götürək?
Övladlar
Bəxtiyar,
Bəxtiyar olsun,
Budur ibadətim,
Etiqadım da.
Qoy sənin adında
Bir qız doğulsun,
Bir oğlan doğulsun
Mənim adımda.
Vəfa ömürdəndir,
cəfa da bizdən
Nəsillər
nur alsın
taleyimizdən.
Günəş kainatdır,
Ulduz – kainat,
Bürclər də sehirli
Qitələridir.
İnsana vətənsə
Sonsuz kainat.
Doğma yer kürəsi
Görüş yeridir.
Baxtın qapısını
Nə yaxşı döydük,

Nə yaxşı bir vaxtda
Dünyaya vardıq.
...Təzədən çahana
Gələ bilsəydik,
Yenə bir-birini
Mütləq tapardıq!

*1981-1985.*

## MÜNDƏRİCAT

